"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ



H.Əliyev

"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"







**Azərbaycan xalqı da tam əmindir ki,** dediyimiz bütün sözlər, verdiyimiz bütün vədlər hər zaman yerinə yetirilir.



**COP29-un Azərbaycanda keçirilməsi münaqişənin həll olunmasının və sülh danışıqlarında irəliləyişin nəticəsidir.**






*1921-ci ildən təhsilimizin keşiyində...*

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur. | Aprel 2024 / № 1 (1126)

# Azərbaycan tarixinin tədrisi və onun təkmilləşdirilməsi yolları

## Ali məktəblərdə Azərbaycan tarixi fənninin tədrisinin mövcud vəziyyəti

"Tarix hər bir insan üçün yeniyetməlikdən başlayaraq, ömrünün sonuna qədər lazımdır".

Heydər ƏLİYEV,
Ümummilli Lider

Müasir dövrdə ali məktəblərin qarşısında duran əsas vəzifə seçdikləri ixtisası dərindən mənimsəyən, tədris prosesində qazandıqları nəzəri bilikləri təcrübədə tətbiq etməyi bacaran kadrlar hazırlamaqdır. Lakin ali təhsilli gənc yalnız öz ixtisasını mükəmməl bilməklə kifayətlənməməli, ölkədə və dünyada baş verən prosesləri təhlil etməyi, düzgün nəticə çıxarmağı bacarmalı, xalqının tarixinə, mədəniyyətinə, adət-ənənələrinə yaxından bələd olmalıdır. Bir sözlə, ali məktəblər, həm də geniş dünyagörüşlü, milli-mənəvi dəyərlərə bağlı, vətənpərvər ruhlu gənc nəsil yetişdirməlidir. Bu baxımdan ixtisasından asılı olmayaraq, universitetlərimizin bütün fakültələrində Azərbaycan tarixi fənninin tədrisi müstəsna əhəmiyyət kəsb edir. Ulu Öndər Heydər Əliyev 31 yanvar 1997-ci ildə Prezident Sarayında Azərbaycan Milli Elmlər Akademiyasının alimləri ilə görüşündə Azərbaycan tarixinin öyrənilməsinin vacibliyini vurğulayaraq demişdi: "Əlbəttə, müstəqil Azərbaycanda fizika, riyaziyyat, biologiya, kimya və yaxud başqa fənlərin hamısı inkişaf etməlidir. Bunların hərəsinin özünəməxsus çərçivəsi var. Amma tarix hər bir insan üçün yeniyetməlikdən başlayaraq, ömrünün sonuna qədər lazımdır".

Tarixin öyrənilməsi mənəvi dəyərlərin qorunması və inkişafına kömək edir, ailədən başlayaraq millət və dövlət səviyyəsinədək yüksələn sevgini artırır. Ölkənin ictimai-siyasi həyatında yaxından iştirak etmək, dövlətini dünyada təmsil etməyi bacarmaq yalnız tarixçilərin, yaxud bir az da geniş götürsək, humanitar sahə mütəxəssislərinin işi deyil. Bu işlə hər bir Azərbaycan vətəndaşı, o cümlədən texniki sahədə çalışan insanlar da məşğul olmalıdır. Bunun üçün onların orta məktəbdə aldığı biliklər kifayət deyil, tarixin tədrisi ali məktəblərdə də daha yüksək səviyyədə davam etdirilməlidir. Nəzərə almaq lazımdır ki, universitetlərdə tələbələrə yalnız hadisə və xronologiyalar deyil, vətənpərvərlik, milli düşüncə, milli mədəniyyət, milli ideya kimi hiss və dəyərlər, müstəqil vətəndaş mövqeyi bildirmək, keçmişlə gələcək arasında körpü qurmaq bacarığı da aşılanır. Məlumdur ki, Azərbaycan tarixinin ən möhtəşəm hadisələrindən olan 44 günlük Vətən müharibəsindəki misilsiz qələbənin qazanılmasında milli köklərə bağlılıq, vətənpərvərlik, tarixdən alınan ibrət dərsləri müstəsna rol oynadı. Təsadüfi deyil ki, Prezident İlham Əliyev 2024-cü il fevralın 14-də keçirilmiş andiçmə mərasimində "...əsas vəzifə gənc nəslin vətənpərvərlik ruhunda, milli ənənələr ruhunda tərbiyə olunmasıdır. Bu məsələyə çox ciddi yanaşmalıyıq və mən bunu əsas vəzifələrdən biri kimi qarşıya qoyuram" - deyərək yeni dövrün əsas tələblərini diqqətə çatdırdı.

Əvvəllər tarix yalnız keçmiş haqqında elm kimi dəyərləndirilirdisə, bu gün ona baxış fərqlidir. Bu gün tarix həm müasirliyin, həm də gələcəyin elmi sayılır. Tarix təkcə hadisələr yığını deyil, eyni zamanda xatirə, təcrübə, mülahizələr elmidir. Əgər insanın ümumi tərifini verməli olsaq, onun haqqında "tarix şüuruna malik varlıq" deyə bilərik. Buna görə də, insanı tarixi məlumatlardan və tarix şüurundan ayırmaq qeyri-mümkündür. Tarixi öyrənməklə insan ondan ibrət dərsi götürür, nəticələr çıxarır, keçmişdə cəmiyyət üçün faydalı olmuş bilikləri mənimsəyir və onları daha da təkmilləşdirərək inkişaf etdirir. Tarixi öyrənməklə insan öz dünyagörüşünü genişləndirir, biliyini artırır. Bu mənada tarixin öyrənilməsi böyük elmi-idraki əhəmiyyətə malikdir.

Tarix elminin tədrisinin ən vacib cəhətlərindən biri də odur ki, onun əsasını insan faktoru təşkil edir. Bu fənn insanların fəaliyyəti nəticəsində meydana gələn hadisə və prosesləri öyrənir. Tarix sadəcə bir problemin araşdırılmasına həsr edilmiş elm sahəsi deyil, doğru nəticəyə gəlmək üçün insanlara istiqamət verən düşüncə tərzidir.

Universitetlərdə təhsil alan gənclər tarixçi təfəkkürü ilə düşünməyi bacarmalıdırlar. Bunun üçün onlar mühazirələri dinləməklə və seminar məşğələlərində iştirak etməklə



kifayətlənməməli, həm də öz bilik səviyyələrini durmadan müstəqil şəkildə artırmalıdırlar.

"Tarix müəllimliyi" ixtisasının təsviri. "Tarix müəllimliyi" üzrə təhsil alan tələbələr həm ümumi tarix, yəni dünya ölkələrinin tarixi, həm də Azərbaycan tarixi ilə bağlı biliklərə yiyələnirlər. Eyni zamanda, arxeologiya, fəlsəfə, pedaqogika, psixologiya və s. kimi əlavə fənləri də öyrənirlər. "Tarix müəllimliyi" ixtisasına yiyələndikdən sonra onlar orta məktəblərdə Azərbaycan tarixi və ümumi tarix fənlərini tədris edə bilirlər. Magistratura təhsili aldıqdan sonra isə müəyyən bir sahə üzrə ixtisaslaşırlar. "Tarix və coğrafiya müəllimliyi" ixtisasının təsviri. "Tarix və coğrafiya müəllimliyi" ixtisası həm tarix, həm də coğrafiyanı tədris edə bilən kadrlar hazırlayır. Bu ixtisas tarix və coğrafiya fənlərinin qarşılıqlı əlaqələri əsasında qurulduğundan, hər iki fənnin eyni səviyyədə mənimsənilməsini təmin edir. İxtisasın üstünlüyü ondadır ki, onu bitirdikdən sonra ümumi təhsil müəssisələrində həm tarix, həm də coğrafiya müəllimi kimi fəaliyyət göstərmək olar.

**Ölkəmizdə "Tarix müəllimliyi" ixtisasına harada yiyələnmək olar?**

* Bakı Dövlət Universiteti (Qazax filialı)
* Azərbaycan Dövlət Pedaqoji Universiteti (Ağcabədi, Quba, Şamaxı, Şəki filialları)
* Sumqayıt Dövlət Universiteti
* Lənkəran Dövlət Universiteti
* Gəncə Dövlət Universiteti
* Mingəçevir Dövlət Universiteti
* Naxçıvan Dövlət Universiteti
* Naxçıvan Müəllimlər İnstitutu
* Xəzər Universiteti
* Bakı Qızlar Universiteti
* Naxçıvan Universiteti

**Ölkəmizdə "Tarix və coğrafiya müəllimliyi" ixtisasına harada yiyələnmək olar?**

* Bakı Dövlət Universiteti (Qazax filialı)
* Azərbaycan Dövlət Pedaqoji Universiteti (Cəlilabad, Şamaxı, Şəki filialları)
* Sumqayıt Dövlət Universiteti
* Lənkəran Dövlət Universiteti
* Gəncə Dövlət Universiteti
* Xəzər Universiteti

Azərbaycanda filiallarla birlikdə 25 ali təhsil müəssisəsində pedaqoji kadr hazırlığı həyata keçirilir. Bunlardan 14-ü dövlət (9-da həm tarix, həm də tarix və coğrafiya müəllimliyi ixtisasları mövcuddur), 4-ü özəl (3-də həm tarix, həm də tarix və coğrafiya müəllimliyi ixtisasları mövcuddur), 1-i digər nazirlik və komitələrin tabeliyində olan ali təhsil müəssisəsi (tarix ixtisası yoxdur), 6-sı isə müxtəlif ali təhsil müəssisələrinin filiallarıdır (hamısında həm tarix, həm də tarix və coğrafiya müəllimliyi ixtisasları mövcuddur).

**Digər ölkələrin ali məktəblərində Vətən tarixi necə tədris olunur?**

Əldə etdiyimiz məlumatlara əsasən, Mirzə Uluqbəy adına Özbəkistan Milli Universitetində ölkənin tarixi bütün ixtisaslarda keçirilir. Tarix yönümlü ixtisaslarda Özbəkistan tarixi 4 dövrə bölünərək 4 ildə, qeyri-tarix yönümlü ixtisaslarda isə müstəqillik əldə edildikdən sonrakı dövrü əhatə etməklə əsas fənn kimi 60 saatla (30 saat mühazirə, 30 saat seminar) tədris olunur. Türkiyə Cümhuriyyətinin Anadolu Universitetində ölkə tarixi tarix yönümlü ixtisaslarda 4 il ərzində hər semestrdə keçirilir. Bəzi qeyri-tarix ixtisaslarında isə (Edebiyyat, Felsefe, Sosioloji bölüm) I və ya II kurslarda Atatürk ilkeleri ve inkılap tarihi I, Atatürk ilkeleri ve inkılap tarihi II əsas fənn kimi tədris edilir. Yeditepe Universitetində də ölkə tarixi tarix yönümlü ixtisaslarda 4 il ərzində keçirilir. Hacettepe Universitetinin Tarix bölümündə 4 il boyu İlçağ tarihi, Tarih metodolojisi, Türk tarihi, Atatürk ilkeleri ve inkılap tarihi I, II, Osmanlı tarihi I, Çağdaş Türkiye tarihi I, II əsas fənn, Antropologiya və arxeologiyaya giriş, Türk kültür tarihi ve tarihi coğrafya, Cumhuriyetin sosyal tarihi, Osmanlı arşiv metinleri isə seçmə fənn kimi tədris planında öz əksini tapmışdır. Ankara Universitetinin tədris planında Atatürk ilkeleri ve inkılap tarihi, İslam tarihi, Eski Anadolu tarihi, Eski Batı tarihi, Selçuklu tarihi, Tarih metodolojisi, Avrupa tarihi I, II, III, Anadolu beylikleri ve Osmanlı Devletinin kuruluş dönemi, Karadeniz Kuzeyindeki Türk kavimleri ve Rusya tarihi, Osmanlı tarihi I, II, Kurtuluş savaşı ve Cumhuriyet dönemi Türkiyesi (1918-1938), Dünya tarihi (XII-XV yy), Cumhuriyet dönemi Türk Siyasal hayatı əsas fənlər kimi təsbit olunmuşdur. Rusiya Federasiyasının M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin (MDU) tədris planına görə, İqtisadiyyat, Politologiya, Filologiya, Kimya fakültələrində Rusiya tarixi 1 semestr ərzində keçirilir. Tarix fakültəsində isə Rusiya tarixi 3 dövrə bölünməklə tədris olunur:1-ci dövr- Rusiya tarixi XIX əsrədək; 2-ci dövr- Rusiya tarixi XIX əsr-XX əsrin əvvəlinədək; 3-cü dövr - Rusiya tarixi XX-XXI əsrlərdə. MDU-da Rus mədəniyyətinin tarixi (XX əsr), XX-XXI əsrlərin Vətən tarixinin arxivşünaslığı fənləri də tədris olunur. Moskva Dövlət Pedaqoji Universitetində (Əsası 1872-ci ildə qoyulmuşdur) 2020-ci ildə tarix yönümlü 4 ixtisas üzrə 5 illik tədris planı təsdiq olunmuşdur.

Tarix və hüquq ixtisasında Rusiya tarixi, ümumi tarix əsas fənlər blokunda olub 72 saat mühazirə, 35 saat seminar olmaqla tədris edilir. Yekunda tələbənin biliyi imtahan vasitəsilə qiymətləndirilir. Tədris planında məcburi təcrübə kimi Pedaqoji və elmi tədqiqat praktikası, həmçinin arxeoloji, arxiv, muzey işi də öz əksini tapmışdır.

Avropa universitetləri siyahısında reputasiyasına görə tarix üzrə 4-cü yerdə qərarlaşan Londondakı Kinq Kollecdə (King's College) birinci tədris ilində tələbələr orta əsrlərdən XX əsrə qədər dünya tarixini öyrənərək, baş vermiş hadisə və proseslərin kökünü araşdırırlar. İkinci tədris ilində onlar müəyyən bölgələrdəki mövzuları daha dərindən öyrənməyə səy göstərirlər. Sonuncu tədris ilində isə orijinal mənbələrin materialları əsasında bir mövzu seçir və bu barədə tədqiqat dissertasiyası yazaraq təqdim edirlər. Göründüyü kimi, tədris ili 3 kursu əhatə edir və qiymətləndirmə kurs işi, esse, imtahan, təqdimat və dissertasiya işinin müdafiəsi ilə aparılır. Ümumilikdə, 3 il ərzində tələbə 360 krediti bitirməlidir.

Böyük Britaniyanın aparıcı universitetlərindən olan, dünyanın ən yaxşı universitetləri siyahısında 140-cı yerdə qərarlaşan Lids (Leeds) Universitetində 3 illik proqramı əhatə edən Tarix bölümündə I kursda 3 modul keçirilir: 1-ci modul əsas olub tələbələrə tarixlə bağlı təməl biliklərin verilməsini təmin edir (20 kredit). 2-ci modulda Britaniya tarixinin təhlili keçmişdən indiyədək keçirilir (20 kredit). 3-cü modul orta əsr, müasir və dünya tarixi olmaqla tələbələr tərəfindən seçilir (20 kredit). İkinci tədris ilində 3-cü modul üzrə seçilmiş mövzuların daha dərindən araşdırılması həyata keçirilir. "Təcrübədə tarix" (History in practice) əsas modul olub, qazanılmış bilik və bacarıqların praktikada tətbiqini aşılayır: arxiv materialları ilə işləmək, ictimai tarixlə məşğul olmaq, müxtəlif tarixi yanaşmaları araşdırmaq, yeni ən son rəqəmsal texnika və platformaları öyrənmək. Bundan başqa, hər biri 20 kredit olmaqla 13 seçmə modul da təqdim edilir.

Üçüncü tədris ili əsasən, tələbənin öz seçdiyi sahə üzrə ixtisaslaşmasına yönəlib. Bu, ya dissertasiya mövzusu (genişləndirilmiş esse), ya da təqdimat mövzusu kimi (ya çap olunmalıdır, ya da veb-səhifədə yerləşdirilməlidir) (40 kredit) araşdırılıb təqdim olunmalıdır. Dissertasiya işi tələbənin apardığı tədqiqatın əsas nəticəsi kimi 12000 sözdən ibarət olmaqla yazılır. Araşdırma təqdimat mövzusu kimi yazıldıqda isə tələbə tarixlə bağlı digər şəxslərin istifadəsi üçün internet resurs yaratmalıdır.

**Nəticə**

Ümumiyyətlə, ali məktəblərdə Vətən tarixinin tədris olunması gənclərimizin geniş dünyagörüşlü, milli şüura malik, vətənpərvər şəxsiyyət kimi formalaşmasına xidmət edir. 44 günlük Vətən müharibəsi bunu bir daha sübut etdi. Bu müharibədə biz şahidi olduq ki, gənclərimiz tariximizi unutmadılar, qəhrəmancasına vuruşdular, Vətən yolunda canlarından keçdilər. Yeni dövrdə isə suverenliyimizi, ərazi bütövlüyümüzü gələcək nəsillərə ötürə biləcək sağlam gənclik yetişməlidir. Hazırda ideoloji təpki Vətən müharibəsi dövründəkindən daha çoxdur. Bu təpkilərə müqavimət göstərə bilən güclü, savadlı, öz tarixi keçmişini yaxşı bilən və ona sahib duran yeni nəsil yetişməlidir. İxtisasından asılı olmayaraq, ali məktəblərdə təhsil alan gənclərin ta qədimdən günümüzə qədər Azərbaycanın keçdiyi tarixi yolu öyrənərək təhlillər aparması və nəticələr çıxarması bu baxımdan olduqca vacibdir.

Vətən mənim bu günüm,
Sabahkı toy düyünüm.
Haqqım var ki, öyünüm
Azərbaycan deyəndə!

**Cəfər CƏFƏROV,**
Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru, tarix elmləri doktoru, professor
"Azərbaycan müəllimi" qəzeti, 08 mart 2024-cü il, №07 (9065), səh. 7

## ADPU-da IQAinAR layihəsi çərçivəsində təlim səfəri yekunlaşıb



15-18 yanvar tarixlərində Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Niderlandın Vittenborg Tətbiqi Elmlər Universitetinin (WUAS) koordinatoru olduğu və Avropa Komissiyası tərəfindən maliyyələşdirilən "Azərbaycan və Rusiya ali təhsil müəssisələrində tədris, təlim və qiymətləndirmə prosesinin daxili keyfiyyət təminatının təkmilləşdirilməsi" (IQAinAR) adlı Erasmus + layihəsi çərçivəsində təlimlər keçirilib. Təlimlərdə layihə konsorsiumunun üzvü olan 8 ali təhsil müəssisəsi İspaniyanın Müqəddəs Entoni Katolik Universiteti (UCAM), Naxçıvan Dövlət Universiteti (NDU), Azərbaycan Texniki Universiteti (AZTU), Bakı Dövlət Universiteti (BDU) və ali təhsil üzrə qurumun Niderlandın 415 International BV təşkilatı, Azərbaycan Respublikasının Təhsildə Keyfiyyət Təminatı Agentliyinin (TKTA) nümayəndələri iştirak ediblər.

Təlim səfərinin açılış günündə TKTA-nın Akkreditasiya və lisenziya şöbəsinin baş məsləhətçisi Heydər Rzayev Azərbaycanın ali təhsil müəssisələrində keyfiyyət təminatı sisteminin tətbiqi, ADPU-nun Keyfiyyət təminatı şöbəsinin müdiri Qalib Şərifov isə ADPU-da daxili keyfiyyət təminatı sistemi barədə təqdimat edib. Layihənin yerli tərəfdaşları olan AZTU, BDU və NDU-nun nümayəndələri Orxan Vətənxah, Asiman İlyasov və Lətif Sadıqov mənsub olduqları ali təhsil müəssisələrində bu sahədə aparılan işlərlə bağlı məruzə ediblər.

Təlimin ikinci günündə, eləcə də ADPU, UCAM və NDU-nun nümayəndələri II işçi paketi üzrə icra olunan tapşırıqlar, universitetlərdə keyfiyyət təminatı üçün layihə çərçivəsində təkmilləşdirilmiş indikatorlar, habelə onların pilot olaraq tətbiqi məsələlərini müzakirə ediblər. Bundan əlavə, xarici tərəfdaşlar tərəfindən layihənin gedişatı, qarşıya çıxan problemlər və onların həlli yolları, maliyyə məsələləri və növbəti işçi paketləri üçün hesabatvermə strategiyası barədə danışılıb.

Təlimin son günündə layihənin növbəti işçi paketləri üzrə həyata keçiriləcək fəaliyyətlərin təqdimatı edilib və müzakirələr aparılıb, növbəti təlimlər və hazırlanacaq akademik nəşrlər üzrə müvafiq tapşırıqlar verilib.

Yekunda iştirakçılara sertifikatlar təqdim olunub.

## Pedaqoji Universitetdə Yaşar Musayevin seminarı keçirilib



ADPU-da 2024-cü ilin Azərbaycan Respublikasında "Yaşıl dünya naminə həmrəylik ili" elan edilməsinə həsr edilmiş Pedaqoji Forumun XII dinləməsi keçirilib. Forumda Almaniyada fəaliyyət göstərən Bakı-Nürnberq Mədəniyyət və Təhsil Mərkəzinin və Almaniya Azərbaycanlılarının Koordinasiya Şurasının İdarə Heyətinin sədri, "Şeffler qrupu" şirkətinin Səthlərin emal texnologiyası üzrə senior vitse-prezidenti, "Şeffler Baltik" şirkətinin baş meneceri, texnika elmləri doktoru Yaşar Musayevin "Təşkilatlarda strateji planlaşdırma" mövzusunda seminarı keçirilib.

Seminarda ADPU-nun rəhbərliyi, dekanlar və kafedra müdirləri, şöbə və mərkəz rəhbərləri, ADPU 2030 Strateji Planlaşdırma Komitəsinin üzvləri və əməkdaşlar iştirak ediblər.

Tədbiri giriş sözü ilə açan rektor Cəfər Cəfərov Yaşar Musayev haqqında məlumat verərək alimin dünya miqyasında uğurlara imza atan tədqiqatçı olduğunu diqqətə çatdırıb.

Tədris işləri üzrə prorektor Eldar Aslanov isə Y.Musayevin diaspor fəaliyyəti barədə danışaraq, onun Avropada Azərbaycanı ən yüksək səviyyədə təmsil etdiyini, elmi-təşkilatı fəaliyyətlə yanaşı, geniş ictimai fəaliyyətə də malik olduğunu qeyd edib.

Daha sonra Yaşar Musayev "Yaşıl dünya naminə həmrəylik ili" çərçivəsində "Təşkilatlarda strateji planlaşdırma" mövzusunda məruzə edib. Məruzədə yaşıl enerji texnologiyaları sahəsi, yeni tədris metodikalarının işlənib hazırlanması, strateji yol xəritəsinə uyğun olaraq yeni ixtisasların hazırlanması məsələlərinə toxunulub. Seminar diskussiya ilə davam edib.

## ADPU və Corc Vaşinqton Universitetinin ikili diplom proqramının tələbə və məzunlarının şəbəkələşmə toplantısı keçirilib



Yanvarın 17-də ADPU ilə ABŞ-nin Corc Vaşinqton Universiteti arasındakı ikili diplom magistr proqramının tələbə və məzunlarının şəbəkələşmə toplantısı təşkil edilib.

Şəbəkələşmə toplantısında Azərbaycan Respublikasının elm və təhsil naziri Emin Əmrullayev, nazir müşaviri Nicat Məmmədli, Dövlət Proqramı İdarəetmə Qrupunun rəhbəri Turan Topalova, ADPU-nun rektoru, prof. Cəfər Cəfərov, Sumqayıt Dövlət Universitetinin rektoru Rüfət Əzizov, ADPU-nun prorektorları dos. Eldar Aslanov və Könül Pirverdiyeva, ikili diplom proqramının menecerləri Sevinc Məmmədova və Tofiq Əhmədov, CVU-nun fakültə dekanı, doktor Maykl Foyer, fakültənin professoru Kolin Qrin, eləcə də proqramda dərs keçən xarici müəllimlər, tələbə və məzunlar iştirak ediblər.

Qeyri-rəsmi formatda keçirilən toplantıda elm və təhsil naziri Emin Əmrullayev proqramın Azərbaycan təhsilinin inkişafı üçün peşəkar təhsil liderlərinin yetişdirilməsindəki önəminə toxunaraq tələbə və məzunlara uğurlar arzulayıb, onların yaratdığı şəbəkənin davamlı olmasını arzulayıb.

ADPU-nun rektoru, prof. Cəfər Cəfərov və CVU-nun dekanı Maykl Foyer də öz növbələrində proqramın icrasından və qarşılıqlı əməkdaşlıqdan məmnunluqlarını ifadə ediblər

Daha sonra tələbə və məzunların fikirləri dinlənilib, onların real iş mühitində qazandığı nailiyyətlər, proqramın onların peşəkar fəaliyyətlərinə təsirləri ətrafında səmimi müzakirələr aparılıb.

Qeyd edək ki, ikili diplom proqramı "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı" çərçivəsində 31 yanvar 2020-ci ildə ADPU və CVU arasında imzalanan əməkdaşlıq müqaviləsinə əsasən həyata keçirilir.

## Pedaqoji Universitet "Web of Science"da indekslənən jurnallarda nəşr olunan elmi işlərin həcminə görə ölkə üzrə ilk beşlikdədir




Elm və Ali Təhsil üzrə Dövlət Agentliyi 2020-2023-cü illər ərzində "Web of Science" beynəlxalq istinad bazasında indekslənən jurnallarda dərc olunan elmi işlərin təhlilinə əsasən Elm və Təhsil Nazirliyinə tabe ilk 5 universitetin göstəricilərini təqdim edib.

Pedaqoji Universitet siyahıda 4-cü yerdə qərarlaşıb.

## "Loqopediyanın nəzəri-praktik əsasları" mövzusunda təlim keçirilib




Yanvarın 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində Təlim-Tədris Mərkəzinin təşkilatçılığı ilə "Loqopediyanın nəzəri-praktik əsasları" mövzusunda növbəti təlim keçirilib. ADPU-nun Məktəbəqədər təhsil fakültəsinin dekanı, dosent Nailə Hüseynovanın təqdimatında keçirilən təlimdə səs pozulmalarının aradan qaldırılması metodları (afoniya və disfoniya), oxu və yazı pozulmalarının korreksiyası (disqrafiya və disleksiya) haqqında geniş məlumat verilib.

Daha sonra təlim iştirakçılarının sualları cavablandırılıb.

## Pedaqoji Universitetdə 20 Yanvar şəhidləri anılıb



Yanvarın 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 20 Yanvar - Ümumxalq Hüzn Günü münasibətilə dəyirmi masa keçirilib.

Əvvəlcə Ümummilli Lider Heydər Əliyevin ali təhsil müəssisəsindəki abidəsinin və "Zəfər guşəsi"nin önünə gül dəstələri qoyulub, Ulu Öndərin və şəhidlərimizin ruhları ehtiramla yad edilib.

ADPU-nun Heydər Əliyev məktəbinin lektoriyasında keçirilən anım tədbirində Universitet rəhbərliyi, müvafiq struktur rəhbərləri, fakültə dekanları, professor-müəllim heyəti və tələbələr iştirak ediblər.

Tədbirdə çıxış edən ADPU-nun Ümumi tarix və tarixin tədrisi texnologiyası kafedrasının baş müəllimi, tarix üzrə fəlsəfə doktoru Taleh Cəfərov Qanlı Yanvar hadisələri haqqında ətraflı məlumat verərək baş verənlərin xalqımızın azadlıq mübarizəsi tarixində müstəsna əhəmiyyətə malik olduğunu qeyd edib. ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində fəaliyyət göstərən Türkoloji Mərkəzin Türk tarixi bölməsinin müdiri, dosent Dəyanət Musayev 20 Yanvar hadisələrindən sonrakı proseslər haqqında fikirlərini söyləyərək, hadisəyə düzgün siyasi qiymət verilməsində Ulu Öndər Heydər Əliyev faktorunun önəmini vurğulayıb.

Qeyd edək ki, eyni zamanda Universitet kollektivi 20 Yanvar faciəsinin 34-cü ildönümü münasibətilə ümumxalq yürüşündə iştirak edərək Şəhidlər Xiyabanını ziyarət ediblər.

## ADPU-nun kafedra müdiri Beynəlxalq Humanitar Forumda iştirak edib



Yanvarın 18-də Rusiya Federasiyasının paytaxtı Moskva şəhərində yerləşən Rusiya Dövlət Humanitar Universitetində "MDB məkanında elm və təhsil sahəsində humanitar əməkdaşlığın vəziyyəti və perspektivləri" mövzusunda Beynəlxalq Forum keçirilib. Forumda 8 ölkəni təmsil etməklə MDB dövlətlərinin humanitar universitetlərinin rektorları, institut direktorları, həmçinin ali məktəblərin humanitar fakültələrinin dekanlarının 50-dən çox məruzə və çıxışları dinlənilib.

Forumda Pedaqoji Universitetin (ADPU) Tarix və coğrafiya fakültəsinin Azərbaycan tarixi kafedrasının müdiri, dosent Naibə Əhmədova iştirak edib.

N.Əhmədova məruzəsində müasir şəraitdə humanitar məsələlərin müzakirəsinin vacibliyini vurğulayaraq bildirib ki, Azərbaycan Respublikası bu sahəyə böyük önəm verən ölkələrdən biridir. Son illər ölkəmizdə çoxsaylı beynəlxalq humanitar əməkdaşlıq tədbirləri keçirilir.

Məruzədə qeyd edilib ki, 33 il əvvəl müstəqilliyini bərpa edən Azərbaycan bu gün çox dinamik inkişaf edir. Azərbaycan Respublikasının həyata keçirdiyi siyasətin əsasını dünya məkanına inteqrasiya, demokratik dəyərlərin inkişafı, tolerantlıq təşkil edir. Ölkə Prezidenti cənab İlham Əliyevin apardığı islahatlar nəticəsində ölkəmizin beynəlxalq aləmdə nüfuzu durmadan artır. Bir çox mötəbər təşkilatların bərabərhüquqlu üzvü olan, bəşəri dəyərlərə sadiqliyini nümayiş etdirən Azərbaycanın dinamik inkişafı beynəlxalq ictimaiyyət tərəfindən ona marağı artırır. Dos. N.Əhmədova diqqətə çatdırıb ki, ölkəmizin MDB ölkələri ilə bütün sahələrdə olduğu kimi humanitar sahədə əlaqələrə verdiyi önəmin nəticəsidir ki, Rusiya Dövlət Humanitar Universitetində azərbaycanşünaslıq proqramı açılmış, Azərbaycan dilinin öyrənilməsi üzrə dərslik hazırlanmışdır. 2019-cu ilin may ayında Azərbaycan Dövlət Pedaqoji Universiteti Rusiya Dövlət Humanitar Universiteti ilə birgə "Bahar Məktəbi" keçirib ki, proqram çərçivəsində tələbələr Bakıda Azərbaycan tarixi, dili və ədəbiyyatı ilə bağlı mühazirələr dinləyib, mədəniyyətimizlə yaxından tanış olublar.

Məruzələrdən sonra müzakirələr aparılıb, MDB məkanında elm və təhsil sahəsində humanitar əməkdaşlığın perspektivlərinə dair Memorandum layihəsi təsdiqlənib. Qeyd edək ki, artıq bir neçə ildir ənənəvi qaydada keçirilən Beynəlxalq Humanitar Forum oxşar formatda və təmsilçilik səviyyəsində keçirilən analoji tədbirlər sırasında özünə layiqli yer tapıb. İlk dəfə 2011-ci ildə Bakıda "XXI əsr: Ümidlər və çağırışlar" devizi altında keçirilən Forumun təşəbbüskarları Azərbaycan Respublikası və Rusiya Federasiyasının prezidentləri olmuşlar. Forum iştirakçıları arasında tanınmış dövlət xadimləri, elmin müxtəlif sahələri üzrə Nobel mükafatı laureatları, böyük beynəlxalq təşkilatların rəhbərləri, o cümlədən dünya siyasi, elmi, intellektual və mədəni elitasının nümayəndələri yer alır. Forumlarda qlobal sahələrlə bağlı dialoqlar, fikir mübadiləsi aparılır, müvafiq qərar və bəyannamələr qəbul edilir.

## "Məktəb Liderliyi" proqramı çərçivəsində effektiv qərarvermə ilə bağlı seminar təşkil olunub




Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi (ETN) və Azərbaycan Dövlət Pedaqoji Universitetinin Strateji İnkişaf Mərkəzinin (ADPU SİM) birgə həyata keçirdiyi "Məktəb liderliyi" proqramının II çağırış üzrə iştirakçıları üçün interaktiv seminar təşkil olunub.

ADPU-nun Kitabxana-İnformasiya Mərkəzində keçirilən tədbirdə "Təşkilati inkişaf üçün effektiv qərarvermə" mövzusunda qonaq-spiker olaraq çıxış edən Nigar Əmrullayeva seminarın birinci hissəsində rasional qərarverməyə təsir edən amillər, selektiv qavrama, məhdud rasionallıq və s. kimi mövzuları əhatə edən interaktiv təqdimatla çıxış edib. Seminarın ikinci hissəsində isə proqram iştirakçıları qrup işi formasında praktik fəaliyyətlərlə məşğul olub, verilən tapşırıqları leqolordan istifadə edərək icra ediblər.

Seminar müddətində "Məktəb liderliyi" proqramının II çağırışının iştirakçıları öz qərarvermə təcrübələrini bölüşüb, seminarın sonunda isə refleksiya edərək qazanılan yeni biliklərin təcrübədə tətbiqinin əhəmiyyətini vurğulayıblar.

Qeyd edək ki, seminarın qonaq-spikeri Nigar Əmrullayeva magistarura səviyyəsi üzrə London Kral Kollecində Təhsilin təşkili və idarə olunması ixtisasında təhsil alıb. Hazırda təhsilini magistratura səviyyəsi üzrə Kembric Universitetində Biznesin idarə edilməsi (icraçı MBA) sahəsi üzrə davam etdirir.

"Məktəb liderliyi" proqramının icrasında məqsəd müasir çağırışlara cavab verən məktəb liderlərinin hazırlanması və onlar arasında şəbəkələşməni təmin etməkdir.

## Pedaqoji Universitet məzunların işlə təmin olunmasına görə ölkə üzrə 4-cü yerdədir



Yanvarın 30-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının 2024-cü il üçün ilk iclası keçirilib.

Giriş sözü ilə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov Elmi Şuranın 2023-cü ildəki son iclasından sonra baş verən ən mühüm hadisələr haqqında məlumat verib, qarşıda duran vəzifələr və perspektivlərdən söz açıb. Daha sonra rektor ötən dövrdə elmi ad və dərəcələr almış əməkdaşlara müvafiq attestatları təqdim edib.

ADPU məzunlarının 2018-2021-ci illərdə işlə təmin olunması vəziyyəti və qarşıda duran vəzifələr barədə məruzə edən tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov diqqətə çatdırıb ki, Dövlət Məşğulluq Agentliyi tərəfindən ali təhsil müəssisələri ilə əməkdaşlıq əsasında hazırlanan "Məzunların məşğulluq reytinqi" platformasının təqdim etdiyi məlumatlara əsasən, 2018-2021-ci illərdə ADPU məzunlarının 51,6%-i işlə təmin olunub. Bu da analoji dövrdə ölkə üzrə məzunların ümumi məşğulluq səviyyəsinə yaxın göstəricidir (58,8%) və Pedaqoji Universitet məzunların işlə təmin olunması üzrə ölkə universitetləri arasında 4-cü yerdədir. 4 il ərzində məzunların işlə təmin olunması üzrə ən yüksək nəticə isə 2021-ci ildə (55,3%) müşahidə olunub.

İxtisaslar üzrə isə ən çox işlə təmin olunan məzunlar say baxımından Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisasını bitirənlər, faiz nisbəti baxımından isə riyaziyyat və informatika müəllimliyi ixtisasını bitirənlərdir (62,5 faiz).

Pedaqoji Universitetin qadın məzunları məzun olduqdan 2-3 ay müddətində işlə təmin olunduğu halda, kişi məzunlarda bu müddət əksərən 13-15 ay olaraq qeydə alınır (hərbi xidmət və digər obyektiv səbəblərdən). ADPU məzunlarının işlədikləri 10 əsas iş yerindən 9-u ixtisas, 1-i qeyri-ixtisas üzrədir.

Dos. Eldar Aslanov, eyni zamanda "ADPU-nun struktur bölmələrində peşəkar təcrübə proqramının təşkili Qaydası"nın təsdiq edilməsi, "ADPU-da ingilis dilinin tədrisinin təkmilləşdirilməsi haqqında Qaydalar"ın təsdiq edilməsi və ADPU-da Təhsil Tədqiqat və Kommunikasiyalar Mərkəzinin (TTKM) yaradılması barədə məruzə edib.

İctimayətlə əlaqələr və marketinq şöbəsinin müdiri Cavid Hüseynov "Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri" müsabiqəsinin elan olunması haqqında təqdimat edib. Qeyd olunub ki, müsabiqə Pedaqoji Universitetin istedadlı tələbələrini seçmək, onların peşəkar inkişafına dəstək olmaq və tələbələr arasından potensial kadr bankını formalaşdırmaq məqsədi ilə həyata keçirilir.

2024-cü ilin fevral-may ayları ərzində həyata keçirilməsi nəzərdə tutulan müsabiqədə yalnız ADPU-nun bakalavriat və magistratura səviyyəsində təhsil alan tələbələri iştirak edə bilər. Yekunda 10 nəfərin qalib olması gözlənilir. Ümumi mükafat fondu 10.000 AZN olan müsabiqənin hər bir qalibinə 1000 AZN məbləğində pul mükafatı və digər hədiyyələr, mentorlarla 1 illik peşəkar inkişaf proqramı, ödənişsiz kurslar, kadr bankına əlavə olunma və referans alma imkanları təqdim olunacaq.

Müsabiqənin finalçıları da kadr bankına əlavə olunmaqla onlara müvafiq sertifikatlar və hədiyyələr təqdim olunacaq.

Daha sonra Maliyyə komissiyasının təklifləri barədə məruzə edən rektorun müşaviri Ümid Mehdiyev vurğulayıb ki, ADPU-da əməkdaşların əmək haqqının minimum 10 faiz artırılması təklif olunur.

Sonda elm və innovasiyalar üzrə prorektor, prof. Asəf Zamanov professor və dosent elmi adlarının verilməsi üçün AAK qarşısında vəsatət qaldırılması barədə məruzə edib və digər cari məsələlər müzakirə olunub.

Yekunda təkliflər və qərar layihələri səsə qoyulub və yekdilliklə qəbul olunub.

## ADPU-nun dosentinin şagirdlərdə vətəndaşlıq tərbiyəsi ilə bağlı monoqrafiyası 6 dildə nəşr olunub



Pedaqoji Universitetin Tarix və coğrafiya fakültəsinin Ümumi pedaqogika kafedrasının dosenti, pedaqogika üzrə fəlsəfə doktoru Emilya Hüseynovanın "Active citizenship in students education of position" ("Şagirdlərdə fəal vətəndaşlıq mövqeyinin tərbiyə olunması") adlı monoqrafiyası Almaniyanın "Lap Lambert Academic Publishing" (2024-cü il, 205 s.) nəşriyyatı tərəfindən 6 dildə, o cümlədən alman, italyan, rus, fransız, ingilis dillərində nəşr olunub.

Monoqrafiyada X-XI sinif şagirdlərində fəal vətəndaşlıq tərbiyəsi probleminin nəzəri əsaslarından, şagirdlərin fəal vətəndaşlıq mövqeyi tutmasının imkanları və səmərəli yollarından, tədris prosesi, eləcə də sinifdənkənar və məktəbdənkənar fəaliyyətləri zamanı onlarda fəal vətəndaşlıq mövqeyinin tərbiyə olunmasının inkişaf amillərindən bəhs edilir. Monoqrafiya müəllimlər, dissertantlar, doktorantlar və tədqiqatçılar üçün nəzərdə tutulub.

## ADPU-da M.Ə.Rəsulzadənin 140 illiyi ilə bağlı kitab sərgisi təşkil olunub




Azərbaycan Dövlət Pedaqoji Universitetinin Kitabxana-İnformasiya Mərkəzində Azərbaycan Xalq Cümhuriyyətinin banilərindən biri, görkəmli ictimai-siyasi xadim Məhəmməd Əmin Rəsulzadənin 140 illik yubileyi ilə bağlı kitab sərgisi təşkil olunub.

Sərgidə Azərbaycan Xalq Cümhuriyyəti və Məhəmməd Əmin Rəsulzadənin ədəbi-publisistik və ictimai-siyasi irsi ilə bağlı kitabxananın fondunda mövcud olan əsərlər nümayiş olunub.

Qeyd edək ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev "Məhəmməd Əmin Rəsulzadənin 140 illiyinin qeyd edilməsi haqqında" 30 dekabr 2023-cü il tarixli 4249 nömrəli Sərəncam imzalayıb.

## ADPU-da akademik heyət üçün "Proqramlaşdırma dili I (Python)" təlimi keçirilib



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində Təlim-Tədris Mərkəzi Alqoritmika şirkəti tərəfindən təşkil olunan "Proqramlaşdırma dili I (Python)" mövzusunda təlim keçirib. Təlim 2023-2024-cü tədris ilinin yaz semestri ərzində "Proqramlaşdırma dili I (Python)" fənnini tədris edəcək müəllimlər üçün nəzərdə tutulub. Təlim "Rəqəmsal bacarıqlar" layihəsinin metodist və təlimçiləri Nübar Əsədova və Fatimə Qasımova tərəfindən interaktiv formada müdavimlərə çatdırılıb.

Təlimlər 2 qrup şəklində pre-test və post-test olmaqla keçirilib.

## ADPU tələbələri "Şagirdə tələbə dəstəyi"nin növbəti mövsümünü başa vurublar



Azərbaycan Dövlət Pedaqoji Universiteti Təhsil Könüllüləri Tələbə Birliyinin (ADPU) təşkilatçılığı ilə 2023-cü ildən icra olunan "Şagirdə tələbə dəstəyi" layihəsi çərçivəsində universitetin könüllü tələbələrindən ibarət komanda tərəfindən Azərbaycan dili, riyaziyyat və ingilis dili fənləri üzrə VII, VIII və IX sinif şagirdləri üçün onlayn dərslər təşkil olunub.

Komanda üzvlərindən Bakı şəhəri 209 nömrəli tam orta məktəbdə fəaliyyət göstərən Aynurə Babayeva və Şölə Rüstəmova şagirdlərlə görüş təşkil etmiş, onlara layihəni uğurla başa vurduqları üçün sertifikatlar təqdim etmişlər.

Həmçinin, tələbələr 2 Fevral – Gənclər Günü münasibətilə şəhid Kamal Məmmədov adına 209 nömrəli tam orta məktəbin direktoru Səbahət Ağayeva tərəfindən mükafatlandırılıb.

## Pedaqoji Universitetdə tələbə gənclər mükafatlandırıldı

Fevralın 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 2 Fevral - Azərbaycan Gəncləri Günü münasibəti ilə universitet rəhbərliyi ötən il ərzində tədrisdə və sosial-ictimai həyatda xüsusi fərqlənən tələbələrlə görüş keçirib.

Görüşdə 16 nəfər yüksək akademik nəticələr əldə edən tələbə və 18 nəfər ictimai-sosial həyatda fəallığı ilə seçilən tələbə olmaqla, ümumilikdə 34 nəfərə universitet rəhbərliyi adından fəxri fərmanlar təqdim edilib.





Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin təşkilatçılığı ilə baş tutan görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, şöbənin müdiri Turan Kərimli və əməkdaşları iştirak ediblər.

Mükafatlandırma mərasimində çıxış edən rektor, prof. Cəfər Cəfərov tələbələri təbrik edərək onlara bundan sonrakı fəaliyyətlərində də uğurlar arzulayıb, Pedaqoji Universitet rəhbərliyinin daim tələbələrin təşəbbüslərini dəstəklədiyini, onlar üçün müvafiq tədris və sosial şəraitin təmini, innovativ yanaşmaların tətbiqi istiqamətində davamlı fəaliyyət göstərildiyini diqqətə çatdırıb. Təəssüratlarını bölüşən tələbələr də öz növbələrində onları maraqlandıran məsələlər haqqında fikir və təkliflərini səsləndiriblər.

# ADPU tələbələrinə möhtəşəm fürsət: "Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri" müsabiqəsi

Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) istedadlı və liderlik bacarığı olan tələbələri seçmək, onların peşəkar inkişafına dəstək olmaq və tələbələr arasından potensial kadr bankını formalaşdırmaq, Universitetin idarəçiliyinə məzunların cəlb edilməsini təşviq etmək məqsədi ilə "Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri" müsabiqəsi keçirilir. "Sən də bacararsan!" şüarı ilə keçirilən müsabiqədə yalnız ADPU-nun bakalavriat və magistratura səviyyələrində təhsil alan tələbələr iştirak edə bilər.

Müsabiqənin 10 qalibinin hər birinə 1000 AZN məbləğində pul mükafatı və digər hədiyyələr, xarici dil və İT üzrə ödənişsiz kurslar, Təşkilat Komitəsi tərəfindən təyin olunacaq mentorlarla 1 illik peşəkar inkişaf proqramı (proqramın sonunda müvafiq referans məktubu veriləcək) və kadr bankına əlavə olunma imkanı təqdim olunacaq.

"bp Azərbaycan", "Prestij-S" Tədris Mərkəzi və "İT Brains Academy" müsabiqənin sponsorlarıdır.

Qeyd edək ki, müsabiqənin finalçıları da kadr bankına əlavə olunmaqla onlara müvafiq sertifikatlar və hədiyyələr təqdim olunacaq.

Müsabiqə 4 mərhələdən ibarət olacaq:

I mərhələdə qeydiyyatdan keçən hər kəsin Azərbaycan və universitet haqqında bilikləri və ümumi dünyagörüşü səviyyələri yoxlanılacaq. Növbəti, II mərhələyə keçən iştirakçıların "Məntiq", "İnformatika" və "Verbal təhlil" blokları üzrə bilikləri qiymətləndiriləcək.

II mərhələdən keçən iştirakçılar isə yarımfinala vəsiqə qazanacaqlar. Əvvəlcə, yarımfinala hazırlıq məqsədi ilə iştirakçılar üçün situasiya və təhlil, layihələrin yazılması və idarə edilməsi, təşkilati idarəetmə və komanda ilə iş, liderlik və natiqlik mövzularında təlimlər təşkil olunacaq.

Yarımfinalda iştirakçılar həm komanda ilə işə görə, həm də fərdi keyfiyyətlərinə görə qiymətləndiriləcəklər. Komanda daxilində situasiya ilə iş, mətn təhlili və layihə təqdimatı bacarıqları, fərdi şəkildə isə komanda ilə iş, natiqlik, təqdimat və özünüifadə, kreativ yanaşma və liderlik bacarıqları yoxlanılacaq.

Final mərhələsinə yüksələn iştirakçıların komanda daxilində böhranın idarə edilməsi, layihə təqdimatı və idarə edilməsi bacarıqları, fərdi şəkildə isə etik davranış və korporativ qaydalar, komanda ilə iş, natiqlik, təqdimat və özünüifadə, kreativ yanaşma və liderlik bacarıqları qiymətləndiriləcək. Qaliblərin müəyyənləşdirilməsində komanda və fərdi səriştələrin qiymətləndirilməsinin nəticələri ilə yanaşı, əvvəlki mərhələlərin də nəticələri nəzərə alınacaq. Yekunda 10 nəfərin qalib olması gözlənilir.

Artıq mart ayının 10-da müsabiqənin I mərhələsi, aprelin 7-də isə II mərhələsi keçirilib və ilkin qeydiyyatdan keçən 900 nəfərədək iştirakçıdan 130 nəfəri yarımfinal mərhələsində iştirak etmək hüququ qazanıb.











## Magistrantların təcrübələrinin başlanmasına həsr olunan konfrans keçirilib



Fevralın 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 2023-2024-cü tədris ilində magistratura səviyyəsində təcrübənin başlanmasına həsr olunmuş konfrans keçirilib. Konfransda Universitet rəhbərliyi və təcrübəyə başlayan magistrantlar iştirak ediblər.

Açılış nitqi ilə çıxış edən Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov və elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov magistrantlara uğur arzulayaraq, vurğulayıblar ki, son illər ADPU-da magistratura təhsilinin məzmunu və keyfiyyətinin artırılması, qabaqcıl sahələr üzrə ixtisaslaşmaların açılması istiqamətində ardıcıl fəaliyyət icra olunur. Məruzə ilə çıxış edən Magistratura və doktorantura şöbəsinin müdiri, s.e.f.d. Rəşad Sadıqov diqqətə çatdırıb ki, ümumilikdə 350 nəfərədək magistrantın iştirak edəcəyi elmi-tədqiqat və istehsalat təcrübəsi 16 fevral - 15 mart tarixlərində, elmi-pedaqoji təcrübə isə 27 mart - 24 aprel tarixlərində təşkil olunacaq. SABAH magistratura ixtisaslaşması üzrə isə 16 fevral - 12 aprel tarixləri aralığında 8 həftəlik elmi-tədqiqat təcrübəsi keçiriləcək.

Diqqətə çatdırılıb ki, təcrübəçi magistrantlar arasında əcnəbi tələbələr və digər ali təhsil müəssisələrində təhsil alan magistrantlar da yer alır. Bildirilib ki, magistrantlar hər bir təcrübədə ayrılıqda maksimum 100 bal toplaya bilərlər. Hər hansı təcrübənin 25 faizindən artığında iştirak etməyən, yaxud yekunda müvafiq keçid balını (51 bal) toplamayan magistrant təcrübədən keçməmiş sayılır.

## ADPU VrinVET Erasmus+ layihəsi çərçivəsində yeni tərəfdaşlığa başlayıb




Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) "Virtual reallıq və innovasiyalar vasitəsilə peşə təhsilinin və təlimin keyfiyyətinin artırılması" (VrinVET) adlı Erasmus+ layihəsi çərçivəsində Türkiyə Respublikasının Nevşehir Hacı Bektaş Veli Universiteti (NEVU) ilə tərəfdaşlığa başlayıb.

13-14 fevral tarixlərində Nevşehir Hacı Bektaş Veli Universitetində VrinVET layihəsi çərçivəsində tərəfdaşların ilk idarəedici görüşü baş tutub. Erasmus+ proqramı çərçivəsində icra olunacaq layihə Avropa Komissiyası tərəfindən maliyyələşdirilir. Layihənin əsas məqsədi məktəb rəhbərlərinə, pedaqoqlara, müəllimlərə və tələbələrə XXI əsrin təhsil texnologiyalarından yaradıcı və səmərəli şəkildə istifadənin öyrədilməsi və həvəsləndirməkdir. Görüşdə Türkiyə, Azərbaycan, Albaniya, Əlcəzair, Yunanıstan, İtaliya və Polşadan olan nümayəndələr iştirak ediblər. Layihə çərçivəsində baş tutmuş səfərdə ADPU-nu Xarici Dillər Mərkəzinin baş müəllimləri Yasəmən Babayeva və Jalə Səmədova təmsil ediblər. Görüşün açılış hissəsində NEVU rektoru, professor Semih Aktekin layihə tərəfdaşlarını salamlayaraq giriş nitqi ilə çıxış edib. Daha sonra layihə rəhbəri, professor Mustafa Hilmi Çolakoğlu layihə və universitet haqqında geniş məlumat verib. Həmçinin Yunanıstan və Albaniyadan olan layihə menecerləri də layihədə görülmüş və görüləcək işlər və layihəyə ayrılmış büdcə haqqında məlumat veriblər. Növbəti gün isə nümayəndələr texnoparka səfər edərək layihədə istifadə olunacaq VR gözlüklər və cihazlarla əyani şəkildə tanış olublar.

## ADPU-nun Kitabxana-İnformasiya Mərkəzi "Əsgərin kitab rəfi" layihəsinə qoşulub



ADPU-nun Kitabxana-İnformasiya Mərkəzi Azərbaycan Respublikası Müdafiə Nazirliyi və "İrəli" İctimai Birliyinin birgə tərəfdaşlığı ilə həyata keçirilən "Əsgərin kitab rəfi" layihəsinə qoşulub. Layihə çərçivəsində vətənimizin keşiyində duran əsgərlər üçün kitablar toplanıb və hədiyyə olunub.

# ADPU-da Beynəlxalq Ana Dili Günü qeyd olunub

Fevralın 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Filologiya fakültəsinin təşkilatçılığı ilə 21 Fevral – Beynəlxalq Ana Dili Gününə həsr olunan tədbir keçirilib. AMEA, BDU, SDU və digər universitetlərin əməkdaşları, ADPU-nun dekanları, kafedra və şöbə müdirləri, eləcə də tələbələrin iştirak etdikləri tədbirdə, əvvəlcə, Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilib və şəhidlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Filologiya fakültəsinin dekanı, dosent Könül Həsənova tədbirdə açılış nitqi ilə çıxış edərək dünyada müqəddəs sayılan 3 şeyin vətən, ana və dil olduğunu vurğulayıb, dilin hər bir insanın mənəviyyatını qoruyan başlıca amil, ananın övladına əmanət etdiyi dili qorumağın hər birimizin borcu olduğunu diqqətə çatdırıb.

ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, professor Mahirə Hüseynova çıxışında, əvvəlcə, Ali Baş Komandan cənab İlham Əliyevi seçkilərdə qələbə qazanması münasibətilə təbrik edib, onun zəkası və şəhidlərimizin şücaəti sayəsində xalqımızın 44 günlük müharibədə qələbə qazandığını qeyd edib. Natiq Ümummilli Lider Heydər Əliyevin fikirlərindən sitat gətirərək öz ana dilini bilməyənlərin şikəst adamlar olduğunu söyləyib, hər bir vətəndaşın öz ana dilini bilməsinin vacib olduğunu deyib.

Daha sonra dahi şəxsiyyətlərin ana dili, türk dili haqqında söylədiyi kəlamların səsləndirildiyi videoçarx nümayiş olunub.

Çıxış edənlərdən fakültənin Azərbaycan dilinin tədrisi texnologiyası kafedrasının professoru, fil.e.d. Vaqif Qurbanov ana dilimizin tarixi barədə nitq söyləmiş, F.Köçərli, M.Mahmudbəyovun ana dilimizin inkişafı üçün həyata keçirdiyi addımlardan söz açmışdır.

Mirzəli Qəmbərovun təqdimatında "Ana yurdum" mahnısı təqdim olunduqdan sonra "Məh" ədəbi dərnəyinin üzvləri Könül Haqverdiyeva və Könül Babayeva Bəxtiyar Vahabzadənin "Ana dilim" şeirini səsləndiriblər.





Müasir Azərbaycan dili kafedrasının müəllimi Nərmin Mehdiyeva çıxışında dilimizin uzun illər boyu yad təsirlərə məruz qalmasına baxmayaraq, öz saflığını itirməyərək müasir dövrə gəlib çıxdığını vurğulayıb.

Əli Həsənovun ifasında "Mənim Azərbaycanım" mahnısı səsləndikdən sonra "Məh" ədəbi dərnəyinin üzvləri Cəlil Məmmədquluzadənin "Anamın Kitabı" əsərindən səhnəcik göstərmiş, "Ana dilim" mahnısını ifa etmişlər. Daha sonra Azərbaycan Milli Konservatoriyasının tələbələrinin ifasında Emin Sabitoğlunun "Şirin dil" mahnısı səsləndirilib, ADPU-nun əcnəbi tələbələri isə Azərbaycan dilinə olan sevgilərini bu dildə müxtəlif şeirlər səsləndirərək bildiriblər.

Tədbirin sonunda ADPU-nun rektoru, prof. Cəfər Cəfərov ölkə elm və təhsilində xidmətləri olan bir qrup alim və ziyalıya "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi (1921-2021)" yubiley medalını təqdim edib.

## Şəki filialında pedaqoji internatura uğurla davam edir



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki filialında pedaqoji internatura uğurla davam edir. Filialın tədris işləri üzrə direktor müavini vəzifəsini icra edən, t.ü.f.d. Vüsal Baxışov və istehsalat təcrübə rəhbəri Asudə Bədəlova Şəki şəhəri Kiş kənd 4 saylı tam orta məktəbdə pedaqoji internaturanın gedişi ilə tanış olublar. Burada pedaqoji internatura keçən xarici dil müəllimliyi (fransız dili üzrə)"ixtisasının IV tədris ili tələbələri və məktəbin rəhbərliyi ilə görüşən nümayəndələr tələbələrə yaradılmış şəraitə görə məktəb rəhbərliyinə təşəkkür edib, tələbələrin internaturada pedaqoji fəaliyyətlə yanaşı, eyni zamanda məktəbdə idarəçilik bacarıqlarını da inkişaf etdirmələrinin vacibliyini vurğulayıblar.

Görüşdə, eyni zamanda meydana çıxan çatışmazlıqlar müzakirə edilərək onların həlli yollarına aydınlıq gətirilib.

## ADPU-da reytinq qiymətləndirilməsi ilə bağlı Keyfiyyət Komissiyasının iclası keçirilib



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru yanında Keyfiyyət Komissiyasının növbəti iclası keçirilib. İclasda Keyfiyyət Komissiyasının üzvləri və Keyfiyyətin təminatı şöbəsi nəzdində fəaliyyət göstərən İşçi Qrupun nümayəndələri, həmçinin xarici maraqlı tərəfdaşlardan M.Rahim adına 7 №-li tam orta məktəbin direktoru Könül Təhməzova iştirak edib.

İclası giriş sözü ilə açan sədr, ADPU-nun ttədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov reytinq qiymətləndirilməsi prosesinin detallarından danışaraq bu prosesdə 5 filial və ADPK da daxil olmaqla, ümumilikdə 1270 müəllimin iştirak etdiyini diqqətə çatdırıb. Keyfiyyətin təminatı şöbəsinin müdiri, dosent Qalib Şərifov ADPU-da professor-müəllim heyətinin reytinq qiymətləndirilməsi üzrə ilkin statistik məlumatları diqqətə çatdırıb. Sonra fakültələr, filial və kollecdə çalışan professor-müəllim heyətinin topladığı balların ortalaması və müəyyən müqayisələr təqdim olunub. Reytinq qiymətləndirilməsinin müvafiq bəndlərinə uyğun olmayan sənədlərlə bağlı Komissiya üzvlərinin fikir və rəyləri dinlənilib. Yekunda səsvermə yolu ilə sənədlərlə bağlı müvafiq qərarlar qəbul olunub və reytinq qiymətləndirilməsi ilə bağlı hesabatın Elmi Şurada müzakirəsinə qərar verilib.

## ADPU əməkdaşları "Müasir təlim metodları" mövzusunda seminarda çıxış ediblər



Azərbaycan Memarlıq və İnşaat Universitetinin (AzMİU) Keyfiyyət Təminatı və Monitorinq Mərkəzi Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Təlim-Tədris Mərkəzi ilə birgə "Müasir təlim metodları" mövzusunda seminar keçirib. Seminarın məqsədi fəal-interaktiv təlim metodlarının akademik heyət tərəfindən mənimlənilməsinə şərait yaratmaq, keyfiyyətli təlim-tədris prosesinin təşkili işinə dəstək göstərməkdir. Seminarı AzMİU-nun tədris işləri üzrə prorektoru, professor Akif Qasımov açaraq güclü rəqabət mühitində bazar iqtisadiyyatının tələblərinə uyğun savadlı, bacarıqlı kadrların yetişdirilməsində müəllimlərin məsuliyyətli və vacib rolundan danışıb.

Seminarda ADPU-nun Təlim-Tədris Mərkəzinin müdiri, p.ü.f.d. Xalidə Həmidova və baş müəllim Rumiyyə Camalova məruzə ilə çıxış ediblər. Yeni tədris metodları, onların müxtəlif ixtisasların mühazirə və məşğələ dərslərində tətbiq olunması istiqamətləri barədə çıxışlarda geniş məlumat verilib. Seminarda müzakirə olunan mövzular ətrafında çıxışlar dinlənilib, elmi-pedaqoji fikir mübadiləsi aparılıb.

## 101 nömrəli məktəbin şagirdləri Pedaqoji Universitetdə ekskursiyada olublar



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tədris Departamentinin nəzdində Məzun koordinasiya və karyera şöbəsinin təşkilatçılığı ilə Bakı şəhəri, Suraxanı rayonu Sovet İttifaqı Qəhrəmanı Əmi Məmmədov adına 101 nömrəli tam orta məktəbin X-XI sinif şagirdləri və müəllimləri Universitetdə ekskursiyada olublar. Şagirdlər, əvvəlcə, Məzun koordinasiya və karyera şöbəsinin müdiri Könül Əsgərovanın rəhbərliyi ilə Universitetdə fəaliyyət göstərən Heydər Əliyev muzeyi və Kitabxana-İnformasiya Mərkəzi ilə tanış olublar.

Daha sonra Filologiya fakültəsinin tədris işləri üzrə dekan müavini Zenfira Abbasova şagirdləri fakültə ilə tanış edərək burada görülən işlər, ixtisaslar və müəllim heyəti haqqında ətraflı məlumat verib.

Sonra şagirdlər müəllim Soltan Hüseynoğlunun dərsində iştirak ediblər. Şagirdləri maraqlandıran sualları ətraflı cavablandıran qocaman müəllim onlara ana dilimizi qorumağı, inkişaf etdirməyi tövsiyə edib. Tələbələrlə görüş şagirdlərdə böyük təssürat yaradıb. Şagirdlər, həmçinin ekskursiya çərçivəsində Universitetin böyük zalında tələbələrin məşq prosesini, Cəlil Məmmədquluzadənin "Anamın kitabı" əsərinin tamaşasını izləyiblər.

## Şamaxı filialında üç günlük tütorluq təlimi



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində fəaliyyət göstərən Təlim-Tədris Mərkəzi tərəfindən 20-22 fevral tarixlərində ADPU-nun Şamaxı filialında üç günlük tütorluq təlimi təşkil olunub.

Təlim Təlim-Tədris Mərkəzinin müdiri, p.ü.f.d. Xalidə Həmidova, ADPU-nun Azərbaycan tarixi kafedrasının müəllimi Günel Əmilova və Bexterev adına Psixatriya və Nevrologiya İnstitutunun klinik psixoloqu Şərafət Şirinli tərəfindən keçirilib.

## Varisin "Qırmızı ləçəklər" romanı müzakirə olunub



Fevralın 23-də Azərbaycan Respublikası Gənclər Fondunun (AzGF) dəstəyi, Böyük Qayıdış Gənclər Təşkilatı İctimai Birliyi (BQGT İB) və Azərbaycan Dövlət Pedaqoji Universiteti Tələbə Gənclər Təşkilatının (ADPU TGT) təşkilatçılığı ilə ADPU-da məşhur yazıçı Varis Yolçiyevlə tələbələrin görüşü keçirilib. Görüşdə yazıçının Azərbaycanın Milli Qəhrəmanı Əlif Hacıyevin həyatı və qəhrəmanlığından bəhs edən və "Xocalıya ədalət!" kampaniyası çərçivəsində çap olunan "Qırmızı ləçəklər" romanı müzakirə olunub.

Görüş zamanı Varis Yolçiyev müəllifi olduğu kitablarla bağlı tələbələrə məlumat verib, öz uğur hekayəsini onlarla bölüşüb. Daha sonra, müəllif Milli Qəhrəman Əlif Hacıyevin həyat və döyüş yoluna həsr erdiyi "Qırmızı ləçəklər" romanının sujet xəttindən, əsəri yazarkən keçirdiyi hisslərdən bəhs edib. Tələbələri maraqlandıran sualları cavablandıran müəllif sonda imzalı kitablarını onlara hədiyyə edib.

## Filiallarda Xocalı soyqırımı anılıb





Fevralın 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi filialında "XX əsrin dəhşətli faciəsi - Xocalı soyqırımı" mövzusunda anım tədbiri keçirilib.

Əvvəlcə Ulu Öndər Heydər Əliyevin və ölkəmizin ərazi bütövlüyü uğrunda canından keçən şəhidlərimizin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Dövlət Himni səsləndirilib.

Filialın direktoru, dos. Mobil Məcidov çıxış edərək tarixən ermənilərin xalqımızın başına gətirdikləri faciələrdən, zaman-zaman tarixi torpaqlarımızı işğal etmələrindən danışıb. M.Məcidov bildirib ki, Xocalı qurbanlarının, bütün şəhidlərimizin qisası alınıb, işğal altındakı torpaqlarımız azad olunub, ərazi bütövlüyümüz və suverenliyimiz bərpa edilib. Biz buna Azərbaycan xalqının birliyi, Müzəffər Ali Baş Komandan, Prezident İlham Əliyevin rəhbərliyi ilə 44 günlük Vətən müharibəsi zamanı rəşadətli Azərbaycan Ordusunun qazandığı şanlı Qələbə nəticəsində nail olduq.

Sonra filialın tərbiyə işləri üzrə direktor müavini, dos. Mahir Səlimov çıxış edərək Xocalı soyqırımının tariximizdə ən dəhşətli faciə olduğunu, dinc insanların məqsədli şəkildə xüsusi amansızlıqla qətlə yetirildiyini söyləyib. Qeyd olunub ki, 613 nəfər, o cümlədən 106 qadın, 63 uşaq və 70 qoca qəddarcasına öldürülüb, 8 ailə tamamilə məhv edilib, 25 uşaq hər iki valideynini, 130 uşaq isə valideynlərindən birini itirib. Həmin gecə 1275 dinc sakin əsir götürülüb, onlardan 150 nəfərin taleyi indi də məlum deyil. "Bunları nəzərə alaraq biz tarixən başımıza gətirilən belə faciələrdən nəticə çıxarmalıyıq, bu faciələrin gələcəkdə unudulmasına yol verməməliyik" – deyə Mahir Səlimov bildirib. Sonda Xocalı faciəsi qurbanlarına həsr olunmuş video çarx izlənilib.

Fevralın 23-də ADPU-nun Quba filialının və Gənclərin İnkişaf və Karyera Mərkəzinin (GİKM) Quba-Xaçmaz regional nümayəndəliyinin təşkilatçılığı ilə 26 Fevral – Xocalı soyqırımının ildönümü münasibəti ilə filialda "Bəşəriyyətə qarşı yönəlmiş ən qəddar soyqırımı – Xocalı faciəsi" mövzusunda tədbir keçirilib.

ADPU-nun Quba filialının Riyaziyyat və təbiət elmləri fakültəsinin əməkdaşı Nəhayət Şirinovanın moderatorluğu ilə keçirilən tədbirdə, əvvəlcə, Xocalı faciəsi qurbanlarının və vətən uğrundan canlarından keçmiş şəhidlərimizin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Tədbirdə filialının direktoru, f.e.d., dosent Yusif Alıyev, Quba Rayon İcra Hakimiyyəti Aparatının İctimai-siyasi, humanitar məsələlər şöbəsinin baş məsləhətçisi Arif Nəbiyev, GİKM-in baş direktoru Azər Əliyev, Əlil Qadınlar Cəmiyyəti İctimai Birliyinin sədri Məhluqə Qaramanlı, filialın Humanitar elmlər kafedrasının müəllimi, tarix üzrə fəlsəfə doktoru Təhminə Əliyeva çıxış ediblər, xarici dil müəllimliyi ixtisasının I tədris ili tələbələrindən Yeganə Quliyeca ingilis dilində "Khojaly genocid" şeirini, Gülyanaq Əhmədova isə filialın müəllimi Rahib Sədullayevin "Xocalım" şeirini səsləndirib.

Daha sonra "Xocalı nişanəsi" filmi nümayiş etdirilib, tələbələrdən Gülyanaq Əhmədova, Nəzrin Talıbova və Yusif Allahverdiyev "Biz qayıtdıq" adlı səhnə təqdim ediblər.

Tədbirdən sonra filialın Kitabxana və elektron resurslar şöbəsinin hazırladığı, Xocalı qurbanlarının xatirəsinə həsr edilən "Qan yaddaşımız" adlı guşəyə baxış keçirilib.

## ADPU-da anım tədbiri: Qisasımız qiyamətə, torpaqlarımız mənfurlara qalmadı...



Fevralın 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Xocalı faciəsinin 32-ci ildönümünə həsr olunmuş "XOCALI: Tarixi Yaddaş" anım tədbiri keçirilib.

Tədbir Gənclər Fondunun dəstəyi, Azərbaycan Respublikası Gənclər Təşkilatları Milli Şurasının (NAYORA), "Böyük Qayıdış" Gənclər Təşkilatı və ADPU-nun birgə təşkilatçılığı ilə reallaşdırılıb.

Tədbir ərazi bütövlüyümüz və suverenliyimiz uğrunda canından keçən qəhrəmanların, o cümlədən Xocalı soyqırımı qurbanlarının əziz xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlayıb.

Anım mərasimində çıxış edən Pedaqoji Universitetin sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev Xocalı faciəsinin Ermənistanın Azərbaycana qarşı hərbi təcavüzünün kulminasiya nöqtəsi və tarixdə analoqu çox az olan hadisələrdən biri olduğunu deyib:

"Xocalıda törədilən amansız və ağlasığmaz vəhşiliklər müxtəlif foto və videolarda, şahidlərin danışdıqlarında əks olunsa da, həmin şəhərdə aşkarlanan kütləvi məzarlıqlar da bunun bariz nümunəsidir. Əfsuslar olsun ki, ilkin nəticələrə görə məzarlıqlardakı insan qalıqları daha çox qadın və uşaqlara aiddir. Ən dəhşətlisi isə odur ki, onların əl-qolları bağlı vəziyyətdə olub və işgəncə verilərək öldürülüblər. Silahsız, əliyalın qadın və uşaqlar onlara qarşı hansı təhlükəni törədə bilərdilər? Danışılandan çox danışılmayan və üzə çıxmayan məqamlar, hadisələr daha çoxdur. Bu qədər faktlar, sübutlar qarşısında dünya hələ də susur. Biz dünyanın demokratiyadan dəm vuran ölkələrinin susduğu ədaləti döyüş meydanında bərpa etdik, qisasımızı qiyamətə, torpaqlarımızı isə mənfurlara buraxmadıq. Döyüş meydanından Qələbə ilə ayrılsaq da, informasiya meydanında mübarizəmiz davam edir. Bu işdə gənclərin üzərinə böyük məsuliyyət düşür. Xocalı həqiqətlərinin dünyaya çatdırılmasında gənclərimiz öz güclərini və biliklərini səfərbər etməlidirlər".

Daha sonra çıxış edən Gənclər Fondunun direktor müavini Orxan Ərəbov, NAYORA-nın sədri Rəfael Hacıbəyli, "Böyük Qayıdış" Gənclər Təşkilatının sədri Nail Şükürov Ali Baş Komandan, Prezident İlham Əliyevin rəhbərliyi ilə Azərbaycan Ordusunun qazandığı şanlı Zəfər nəticəsində ərazi bütövlüyümüzün bərpa olunmasından, həmin ərazilərdə aparılan bərpa-quruculuq işlərindən və sakinlərin öz doğma yurd-yuvalarına köçürülməsindən danışıblar. Ötən il keçirilən lokal antiterror tədbirlərindən sonra Xocalıya sancılan üçrəngli Azərbaycan bayrağının soyqırımı yarasına məlhəm olduğunu deyən natiqlər 1992-ci il fevralın 25-dən 26-na keçən gecə törədilən qətliama hələ də beynəlxalq səviyyədə hüquqi-siyasi qiymət verilmədiyini təəssüflə qeyd ediblər. Gənclərin Vətən müharibəsində göstərdiyi şücaətdən bəhs edən çıxışçılar onların informasiya cəbhəsində də aktiv mübarizə aparmaqlarının, öz bilikləri, əldə etdikləri dəqiq faktlarla Xocalı soyqırımını gələcək nəsillərə, o cümlədən beynəlxalq ictimaiyyətə çatdırmaqda fəallıq nümayiş etdirmələrinin vacibliyini qeyd ediblər.

Anım mərasimində o məşum gecədə başlarına gələnlərdən, erməni qəsbkarları tərəfindən törədilən amansız faciədən danışan Xocalı sakinləri Valeh Hüseynov və Samirə Hüseynova, həmçinin Aprel döyüşlərinin qazisi, Xüsusi Təyinatlı Qüvvələrin ehtiyatda olan baş leytenantı Əhliyat Mehdiyev xalqımızın sarsılmayan mübarizə ruhundan və rəşadətli Azərbaycan Ordusunun düşmən üzərində tarixi Qələbə qazanaraq doğma torpaqlarımızı işğaldan azad etməsi ilə faciə qurbanlarının, eləcə də, bütün şəhidlərimizin qisasının alınmasından söhbət açıblar. Tezliklə Xocalıda həyatın durduğu yerdən davam edəcəyini, bir gecədə donan şəhərin doğma sakinlərin isti nəfəsi ilə buzunun açılacağını bildirən çıxışçılar bununla da faciə qurbanlarının narahat ruhlarının uzun illərdən sonra dinclik tapacağını diqqətə çatdırıblar.

## Pedaqoji Universitetdə Xocalı faciəsinin 32-ci ildönümü qeyd olunub



Fevralın 26-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Xocalı faciəsinin 32-ci ildönümü münasibətilə dəyirmi masa keçirilib.

Əvvəlcə Ümummilli Lider Heydər Əliyevin ali təhsil müəssisəsindəki abidəsinin və "Zəfər guşəsi"nin önünə gül dəstələri qoyulub, Ulu Öndərin və şəhidlərimizin ruhları ehtiramla yad edilib.

ADPU-nun Heydər Əliyev məktəbinin lektoriyasında keçirilən dəyirmi masada Universitet rəhbərliyi, müvafiq struktur rəhbərləri, fakültə dekanları, professor-müəllim heyəti və tələbələr iştirak ediblər.

Açılış nitqi ilə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov qeyd edib ki, Müzəffər Ali Baş Komandan İlham Əliyev ötən ilin oktyabrın 15-də Azərbaycan bayrağını Xankəndidə, Xocalıda, Ağdərədə, Xocavənddə ucaltdı. Bu il Xocalı faciəsinin ildönümünü daha fərqli ovqatda qeyd edirik. Baxmayaraq ki, Xocalı yarası heç zaman sağalmaz, amma bu gün bu torpaqda üçrəngli bayrağımızın dalğalanması bir daha sübut edir ki, Azərbaycan xalqı yenilməz, məğrur xalqdır.

ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində fəaliyyət göstərən Türkoloji Mərkəzin Türk tarixi bölməsinin müdiri, dosent Dəyanət Musayev Xocalı faciəsi və sonrakı proseslər haqqında fikirlərini söyləyərək, hadisəyə düzgün siyasi qiymət verilməsində Ulu Öndər Heydər Əliyev faktorunun vacibliyini vurğulayıb.

Tədbirin sonunda Filologiya fakültəsinin III tədris ili tələbəsi Aytac Muradlı Mahirə Nağıqızının "Şəhidlər" şeirini səsləndirib, Xocalı dəhşətlərini özündə əks etdirən videoçarxlar izlənilib.

## ADPU-da "Davamlı siyasət sənədi" qəbul olunub, Psixoloji xidmət laboratoriyası yaradılıb



Fevralın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının iclası keçirilib.

Açılış nitqi ilə çıxış edən ADPU-nun rektoru, Elmi Şuranın sədri, professor Cəfər Cəfərov ötən dövr ərzində həyata keçirilən fəaliyyətlər haqqında danışaraq, artıq payız semestrinin imtahan sessiyasının uğurla yekunlaşdığını diqqətə çatdırıb.

Məruzə edən Tədris departamentinin direktoru, dosent Sənan Əliyev ADPU-da 2023-2024-cü tədris ilinin payız semestrinin imtahan sessiyasının nəticələri barədə hesabatı təqdim edib. Bildirilib ki, 7 yanvar - 2 fevral tarixlərində keçirilən imtahan sessiyasının təşkili üçün İmtahan İdarəetmə Qrupu, İmtahan Qərargahı və Appelyasiya Komissiyası, o cümlədən nəzarətçi qrupları təşkil olunub. İmtahanlarda bakalavriatura səviyyəsi üzrə 9978, magistratura səviyyəsi üzrə 644 nəfər olmaqla ümumilikdə 10622 nəfər tələbə iştirak edib. Üzürlü səbəbdən imtahana qatılmayan 482 nəfər tələbə üçün sonradan imtahan keçirilib. Yoluxucu xəstəlik səbəbindən imtahanlarda iştirak edə bilməyən 12 nəfər tələbə üçün isə ADPU Elmi Şurasının müvafiq qərarına uyğun olaraq onlayn formada imtahan təşkil olunub.

Hesabata əsasən, sessiya ərzində İmtahan Qərargahına 111 müraciət (keçən yaz sessiyasında 135) olub ki, bunlardan 52-i təsdiqini tapmayıb, 59-u isə tələbələrin xeyrinə həll olunub. İmtahan qaydalarını pozduğuna görə 139 nəfər tələbə (ötən yaz sessiyasında 74 nəfər) imtahandan kənarlaşdırılıb və nəticələri ləğv olunub. Apelyasiya Komissiyasına isə 2082 müraciət olub.

Bakalavriat və magistratura səviyyələrində uyğun olaraq, müvəffəqiyyət göstəricisi 88 və 98 faiz (keçən ilin müvafiq sessiyasında 84 və 74 faiz), keyfiyyət göstəricisi isə 44 və 76 faiz (keçən ilin müvafiq sessiyasında 46 və 68 faiz) təşkil edib. Bakalavriat səviyyəsində müvəffəqiyyət, magistratura səviyyəsində isə həm müvəffəqiyyət, həm də keyfiyyət göstəricilərində əhəmiyyətli artım müşahidə olunur. ADPU filialları arasında isə bakalavriat üzrə ən yüksək müvəffəqiyyət göstəricisi 91 faizlə Cəlilabad filialında, ən yüksək keyfiyyət göstəricisi isə 38,3 faizlə Quba filialında qeydə alınıb. Həmçinin, imtahan sessiyası müddətində "Google Form" vasitəsilə tələbələr arasında onlayn sorğu təşkil olunub. 2050 tələbənin qatıldığı sorğuda ADPU və onun filialları, o cümlədən ADPK tələbələri iştirak edib. Həmçinin, imtahan prosesində 2 əməkdaş və 17 tələbə olmaqla 19 nəfər müşahidəçi qismində iştirak edib.

Daha sonra cari məsələlər müzakirə olunub. Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov ADPU-nun 2024-cü il üçün Fəaliyyət Planının təsdiqi haqqında, "Psixoloji xidmət laboratoriyasının Əsasnamə"sinin təsdiqi və tədris-metodiki vəsaitlərinin nəşrinə icazə verilməsi barədə, Tədris departamentinin direktoru, dosent Sənan Əliyev imtahan sessiyasının nəticələrinə əsasən adlı təqaüd alan namizədlərin təsdiqi barədə, Keyfiyyətin təminatı şöbəsinin müdiri, dosent Qalib Şərifov "ADPU-nun Davamlı siyasət sənədi"nin təsdiqi haqqında, elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov monoqrafiyaların nəşrinə icazə verilməsi və dosent elmi adının verilməsi üçün AAK qarşısında vəsatət qaldırılması barədə məruzə ediblər.

Sonda müzakirəyə çıxarılan məsələlərlə bağlı təklif və suallar səsləndirilib, müsbət qərarlar qəbul olunub.

## ADPU-da "Gənc tədqiqatçılar üçün IMRAD modeli" mövzusunda seminar



Fevralın 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Azərbaycan Gənclər Fondunun maliyyə dəstəyi ilə "Düşüncə" Gənclərin İnkişafına Dəstək İctimai Birliyi tərəfindən keçirilən "Gənc tədqiqatçılar üçün elmi data bazalar haqqında seminarlar" layihəsi çərçivəsində "Gənc tədqiqatçılar üçün IMRAD modeli" mövzusunda seminara start verilib.

Seminarda ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Elmi-təşkilati şöbənin müdiri, professor İbrahim Bayramov, Magistratura və doktorantura şöbəsinin müdiri, s.e.f.d. Rəşad Sadıqov, eləcə də universitetin gənc tədqiqatçıları, magistrant və tələbələri iştirak ediblər.

Açılış sözü ilə çıxış edən ADPU-nun prorektoru, prof. Asəf Zamanov gənc tədqiqatçıların elmi araşdırma və məqalə yazma bacarıqlarına yiyələnməsinin zəruriliyini dilə gətirib, bu bacarıqların formalaşdırılmasında maarifləndirici seminarların əhəmiyyətinə toxunub.

Daha sonra ekspert Sevinc Ədilovanın təqdimatında "IMRAD modeli nədir?", "IMRAD modelindən istifadə qaydaları" və "Məqalələrin tərtibatında IMRAD modelinin üstünlükləri" mövzularında iştirakçılar üçün təlimlərə start verilib. IMRAD modeli giriş, metodlar, nəticələr və müzakirə mərhələlərini əhatə edən elmi məqalə yazma qaydasıdır. Qeyd edək ki, iki gün davam edəcək seminarın sonunda təlimi uğurla tamamlayan iştirakçılara sertifikatlar təqdim olunacaq.

## Vitse-spiker Adil Əliyev gələcəyin müəllimləri ilə görüşüb

Fevralın 28-də Milli Məclisin sədr müavini, Gənclər və idman komitəsinin sədri Adil Əliyev "Azərbaycanda gənclər siyasəti: uğurlar və qarşıda duran vəzifələr" mövzusunda Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) tələbələri ilə görüş keçirib. Görüşdə Universitetdə təhsil alan şəhid ailələrinin üzvləri, qazilər, idmançılar və fəal tələbələr iştirak edib. Tədbir şəhidlərin xatirəsinin anılması və Dövlət Himninin səsləndirilməsi ilə başlayıb.

Qonağı salamlayan Pedaqoji Universitetinin rektoru, professor Cəfər Cəfərov Universitet barəsində məlumat verib, eləcə də, dövlət başçısının təhsilə və gənclər siyasətlərinə göstərdiyi yüksək diqqət və qayğıdan bəhs edərək, bu siyasətlərin uğurla həyata keçirilməsinin gələcəyimizin təminatı olmasını qeyd edib.

Rektor Pedaqoji Universitetdə dövlət gənclər siyasətinə uyğun olaraq sistemli fəaliyyət icra olunduğunu diqqətə çatdırıb. Qeyd olunub ki, ADPU-da müxtəlif istiqamətlər üzrə fəaliyyət göstərən tələbə təşkilatları, ümumilikdə 60-dək klub və dərnəklər aktiv fəaliyyətdədirlər.

Vurğulanıb ki, Universitetdə vətənpərvərlik şüurunun tərbiyə olunması istiqamətində də ardıcıl işlər aparılır. ADPU-nun tələbə və məzunları arasında Vətən müharibəsində döyüşən kifayət qədər gənclər var. Onlardan 16 nəfəri Vətən müharibəsində və 1 nəfəri isə 2022-ci ilin sentyabr döyüşlərində şəhidlik zirvəsinə yüksəlib. ADPU-da şəhid ailələrinin üzvü olan, o cümlədən müharibə iştirakçısı olan tələbələrin ehtiyaclarının təmini, onlara zəruri tədris şəraitinin yaradılması daim diqqət mərkəzində saxlanılır.

Milli Məclisin sədr müavini Adil Əliyev çıxışında Milli Məclisin fəaliyyəti barəsində tələbələrə məlumat vermiş, Gənclər və idman komitəsinin məşğul olduğu istiqamətləri qeyd edərək, Komitənin yaz sessiyası üçün təsdiq olunmuş İş Planına uyğun olaraq mütəmadi olaraq görüşlərin keçirildiyini bildirib.

Müasir gənclər siyasətinin əsasının məhz Ulu Öndər Heydər Əliyevin adı ilə bağlı olmasını bildirən vitse-spiker Ümummilli Liderin imzaladığı müvafiq Sərəncamla MDB məkanında və Şərqi Avropa ölkələri arasında ilk dəfə ölkəmizdə gənclər üçün xüsusi bir günün təsis olunmasını, hələ ötən əsrin 70-80-ci illərində yüzlərlə azərbaycanlı gəncin keçmiş SSRİ-nin aparıcı ali məktəblərinə göndərilməsini və orada müxtəlif ixtisaslar üzrə təhsil almalarına şərait yaradılmasını diqqətə çatdırıb.

Adil Əliyev çıxışında xalqın təkidli tələbi ilə 1993-cü ildə hakimiyyətə qayıdan Ulu Öndərin bütün sahələrdə olduğu kimi gənclər və idman sahəsində də əsasını qoyduğu siyasətin müxtəlif çağırışlarla üzləşməsini, çevrilişlərin qarşısını almasını və sabitliyi təmin etməklə bərabər gənclər siyasətini hər zaman ön planda saxlamasını bildirib. Bu məqsədlə də, ölkəmizdə Gənclər və İdman Nazirliyi yaradılıb və 2 fevral 1996-cı ildə Gənclərin I Forumu keçirilib, eləcə də, bu sahədə zəruri qanunvericilik bazasının formalaşdırılıb.

Azərbaycançılıq məfkurəsinin din, dil, etnik və digər mənsubiyyətindən asılı olmayaraq bütün azərbaycanlıların ümumi vətəninə bağlılığını özündə ehtiva etməsini, Ulu Öndər Heydər Əliyevin müəyyənləşdirdiyi gənclər siyasətinin bu gün cənab Prezident İlham Əliyev tərəfindən uğurla davam






etdirilməsini diqqətə çatdıraraq Müzəffər Ali Baş Komandanın Ulu Öndərin yaratdığı təməllər üzərində yürütdüyü böyük siyasi xəttə daxil olan gənclər və idman siyasəti sayəsində Azərbaycan idmanı və gənclər siyasətinin böyük tərəqqiyə nail olmasını bildirən vitse-spiker ölkəmizdə gənclər sahəsində dövlət siyasətinin kompleks şəkildə hazırlanaraq həyata keçirildiyini, nəticədə gənclərlə iş sahəsində ciddi keyfiyyət dəyişiklikləri əldə edildiyini, gənclərin ictimai həyatda rolunun önəmli dərəcədə artdığını vurğulayıb.

Dövlət başçısının andiçmə mərasimində gənclər sahəsinə gündəliyində xüsusi yer verməsi Azərbaycan gəncinə verilən dəyərdir. - deyə qeyd edən vitse-spiker Azərbaycan gəncliyi ilə bağlı dövlət proqramları, gənclərin inkişaf strategiyası, eləcə də xaricdə təhsillə bağlı müxtəlif dövlət proqramlarının qəbul edilərək uğurla icra edilməsini, hər il 10 nəfər gəncə Prezident təqaüdü verilməsini, gənclərin ictimai həyatda iştirakını təmin etmək məqsədilə gənclər mərkəzləri, gənclər evləri, olimpiya idman mərkəzlərinin fəaliyyət göstərdiyini qeyd edib. Təhsilin dövlətimiz üçün olduqca vacib sahələrdən biri olmasını qeyd edərək, təhsil siyasətinin əsas hədəflərindən birinin gənc nəsillərin savadlı və vətənpərvər ruhda yetişdirilməsi olduğu, bu məqsədlə Dövlət Proqramlarının hazırda uğurla icra edildiyi və gənclərimizin xarici ölkələrdə təhsilə əlçatanlığının dövlət hesabına tam təmin edildiyi diqqətə çatdırılıb. Gənclərin də öz növbəsində dövlətin onlar üçün yaratdığı imkanlardan səmərəli istifadə etməsini qeyd edən vitse-spiker Azərbaycan gəncliyinin istər Vətən müharibəsində, istərsə də ondan sonrakı dövrdə üzərinə düşən tarixi vəzifələrin öhdəsindən layiqincə gəlməsini, Prezident, Müzəffər Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi altında Vətən müharibəsinin əsas hərəkət qüvvəsinin gənclər olmasını qeyd edib. Dövlət başçısının dediyi kimi, 44 günlük döyüşlərdə bir fərarilik faktının belə qeydə alınmaması, məhz bu qələbənin də gənclərlə bağlı aparılan uğurlu siyasətin nəticəsi olduğunu, Vətən müharibəsində gənclərimizin yüksək fiziki və mənəvi hazırlığı və vətənpərvərlik hissinin əməldə sübut olunmasını qeyd edib.

Sədr müavini üzünü gələcəyin müəllimlərinə tutaraq gənclərlə bağlı dövlət siyasətinin rolunun fiziki və mənəvi hazırlıqla, vətənpərvərlik işi ilə bağlı olması ilə bərabər, gənc nəslin tərbiyəsində cəmiyyətin rolundan bəhs etmiş, gənclərimizin Azərbaycan həqiqətlərinin dünyaya çatdırılmasında da əhəmiyyətli rol oynadığını bildirmişdir.

Çıxışının sonunda COP-29-un ölkəmizə təyin edilməsinin beynəlxalq ictimaiyyətin ölkəmizə verdiyi dəstəyin, həmrəyliyin əyani nümayişi, dünyada artan nüfuzumuzun göstəricisi olmasını qeyd edən vitse-spiker gənclərin könüllü fəaliyyətinə xüsusi diqqət çəkib. Çıxışın yekununda gənclərə müraciət edərək bilik və bacarıqların inkişafına xüsusi diqqət ayırmağı tövsiyə edib.

Daha sonra tələbələrlə onları maraqlandıran mövzular ətrafında geniş müzakirə aparılıb və tədbirin sonunda xatirə şəkli çəkdirilib. Milli Məclisin Gənclər və idman komitəsi adından şəhid ailəsinin üzvü və müharibə iştirakçısı olan tələbələrə hədiyyələr təqdim olunub.

Tədbirdən sonra sədr müavini Universitetin xatirə kitabına ürək sözlərini yazıb.

## Pedaqoji Universitetdə "Sağlam həyat tərzi" mövzusunda görüş keçirilib




Fevralın 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Azərbaycan Respublikasının Səhiyyə Nazirliyin İctimai Səhiyyə və İslahatlar Mərkəzinin səlahiyyətli nümayəndəsi Zümrüd Kazımova tərəfindən "Sağlam həyat tərzi" mövzusunda tələbələrlə görüş keçirilib.

ADPU-nun Heydər Əliyev məktəbinin lektoriyasında keçirilən görüşdə universitetin Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli açılış sözü ilə çıxış edərək gənclərimizin, tələbələrimizin gələcəkdə yarana biləcək riskli xəstəliklərdən, patologiyalardan qorunması üçün sağlam həyat tərzinin diqqətdən kənarda qalmamalı olduğunu vurğulamış, belə görüşlərin gələcəkdə də mütəmadi keçirilməsinin zəruriliyini qeyd etmişdir.

Görüş zamanı tələbələrə sağlamlıq, fiziki aktivlik, oturaq həyat tərzi, zərərli vərdişlər, yuxu pozğunluqları, gigienik qaydalar barəsində ətraflı məlumatlar verilib, mövzu ilə əlaqədar təqdimat nümayiş etdirilib və tələbələrlə müzakirə zamanı onları maraqlandıran suallar cavablandırılıb.

Görüşün sonunda tələbələrə maarifləndirici bukletlər, posterlər, flayerlər paylanılıb.

## ADPU tələbələri Qara Qarayevin ev muzeyinə ekskursiya ediblər



Martın 3-də Azərbaycan Dövlət Pedaqoji Universiteti Təhsil Könüllüləri Tələbə Birliyinin (ADPU TKTB) təşkilatçılığı ilə tələbələrin Qara Qarayevin ev muzeyinə ekskursiyası təşkil olunub.

Ekskursiya zamanı tələbələr görkəmli bəstəkar Qara Qarayevin həyat və yaradıcılıq yolu ilə yaxından tanış olmuş, əsərləri haqqında geniş məlumat əldə etmişlər.

Muzeydə sərgilənən, bəstəkara məxsus olan şəxsi əşyalarla – eksponatlarla tanış olan tələbələr, həmçinin onları maraqlandıran suallara cavab tapmışlar.

# ADPU-da Qərbi Azərbaycan Araşdırmalar Mərkəzi və Türkoloji Mərkəzin açılışı olub





Martın 1-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Beynəlxalq əlaqələr üzrə prorektorluğun təşkilatçılığı ilə "Qərbi Azərbaycan - yurd yerimiz" mövzusunda konfrans keçirilib, eyni zamanda Qərbi Azərbaycan Araşdırmalar Mərkəzi və Türkoloji Mərkəzin açılışı olub.

Tədbirdə ADPU-nun rəhbərliyi ilə yanaşı Milli Məclisin deputatları, ali təhsil ocaqlarının rektorları, Qərbi Azərbaycan İcmasının üzvləri və ziyalılar iştirak ediblər.

Əvvəlcə, qonaqlar Qərbi Azərbaycan Araşdırmalar Mərkəzi və Türkoloji Mərkəzdə olaraq onların fəaliyyəti, elmi araşdırmaları ilə yaxından tanış olublar.

Konfransda çıxış edən ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, konfransın və yeni mərkəzlərin yaradılmasının təşəbbüskarı olan professor Mahirə Hüseynova Pedaqoji Universitetdə Qərbi Azərbaycan Araşdırmalar Mərkəzi və Türkoloji Mərkəzin fəaliyyətə başlamasının həm universitet, həm də dövlətimiz üçün əhəmiyyətli hadisə olduğunu vurğulamış, Qərbi Azərbaycanın vətənimizin ayrılmaz hissəsi olduğunu dilə gətirmişdir. O, eyni zamanda, türk dünyası ilə qarşılıqlı əlaqələrimizin Ulu Öndər Heydər Əliyev tərəfindən bərpa edildiyini, cənab Prezident İlham Əliyevin uğurlu siyasətinin nəticəsi olaraq bu münasibətlərin gündən-günə daha da genişləndiyi diqqətə çatdırıb.

Çıxış edən ADPU-nun Elmi-təşkilati şöbəsinin müdiri, prof. İbrahim Bayramov Qərbi Azərbaycanın ölkəmizin tarixi torpaqları olduğunu söyləyərək bunu 3 faktla əsaslandırmışdır: etnik tərkib, toponimlər, tarixi abidələr. Professor bu faktları sübut edən əsaslı dəlillər səsləndirmiş, bu sahədə apardığı elmi-tədqiqat nəticələrini qeyd etmişdir.

ADPU-nun İbtidai təhsilin pedaqogikası kafedrasının müdiri, prof. Fərrux Rüstəmov isə Qərbi Azərbaycanın təhsil və dövlətçilik tarixinin araşdırılmasının önəmini qeyd edərək, İrəvan Kişi Gimnaziyasının ən görkəmli məzunlarının məhz azərbaycanlı olan Əziz Əliyev, Mustafa Topçubaşov və Əhməd Rəcəbli olduğunu vurğulayıb, yaradılan mərkəzin elm aləminə uğurlu töhvələr verəcəyinə əminliyini ifadə edib.

Qərbi Azərbaycan İcmasının sədri, Milli Məclisin deputatı Əziz Ələkbərli çıxışında Qərbi Azərbaycan adının dövlət səviyyəsində ilk dəfə Ümummilli Lider Heydər Əliyev tərəfindən dilə gətirildiyini diqqətə çatdırıb. O, 2022-ci ildə cənab Prezident İlham Əliyev tərəfindən Qərbi Azərbaycan İcmasının yaradıldığını xatırladaraq, 1 il ərzində Qərbi Azərbaycan İcmasının öz fəaliyyətini xeyli genişləndirdiyini vurğulayıb. ADPU-da Qərbi Azərbaycan Araşdırmalar Mərkəzinin yaradılmasındakı xidmətlərinə görə prof. Mahirə Hüseynovaya təşəkkürünü bildirib.

Azərbaycanda Atatürk Mərkəzinin direktoru, Milli Məclisin deputatı, professor Nizami Cəfərov türkologiya və türkçülüyün qarşılıqlı əlaqəsindən bəhs edərək bu bağlılığın 3 dövrə bölündüyünü söyləyib, təsəvvürlər dövrü barədə tədbir iştirakçılarına məlumat verib.

Natiq, cənab Prezident İlham Əliyevin andiçmə mərasimində açıq kontekstdə söylədiyi türk dövlətləri ilə ölkəmizin qarşılıqlı əlaqələrinin bundan sonra daha da genişlənəcəyi fikrini xatırladaraq Pedaqoji Universitetdə Türkoloji Mərkəzin yaradılmasının bu baxımdan da alqışalayiq addım olduğunu söyləyib.

Çıxış edən Milli Məclisin deputatı Sadiq Quliyev mənfur düşmənlərimizin tarixən türkləri parçalamaq, türk dövlətlərinin birləşməyinin qarşısını almaq fikrində olduqlarını söyləyərək, 1926-cı ildə Birinci Türkoloji Qurultayın keçirilməsinin onların bu planlarını sarsıtdığını qeyd edib.

Çıxış edənlərdən AMEA-nın vitse-prezidenti, akademik Rasim Əliquliyev ADPU-da Qərbi Azərbaycan Araşdırmalar Mərkəzinin yaradılmasının dövlətçiliyimiz üçün əhəmiyyətli addım olduğunu vurğulamış, ADPU-nun 100 ildən artıq tarixə malik müəllim yetişdirən məbəd olduğunu qeyd edərək tələbələrin gələcəkdə pedaqoji kadr olaraq Qərbi Azərbaycan həqiqətlərini şagirdlərə çatdıracağını dilə gətirmişdir.

Milli Məclisin deputatı Musa Urud isə Qərbi Azərbaycan İcmasının fəaliyyətə başladığı dövrdən etibarən qarşıya qoyulan əsas məqsədlərə nail olunduğunu, bu qurumun fəaliyyəti nəticəsində qərbi azərbaycanlılar barədə beynəlxalq təşkilatlarda çıxışlar səsləndirildiyini, xaricdə məqalələrin çap etdirildiyini söyləyib. O, bu gün Pedaqoji Universitetdə belə bir mərkəzin yaradılmasının artıq bu haqda elmi araşdırmaların sistemli şəkildə aparılacağına təkan verəcəyini qeyd edib.

Çıxış edən Azərbaycanda Atatürk Mərkəzinin əməkdaşı Nazir Əhməd isə indiki Ermənistan ərazisinin tarixən azərbaycanlılara məxsus olduğunu qeyd etmiş, bu fikirlərini faktlarla əsaslandırmışdır.

# ADPU-da alman mütəxəssisin təlimi keçirilib

Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "ARI Xaricdə Təhsil Mərkəzi" tərəfindən təlim keçirilib.

Mərkəzin Almaniyadan dəvət etdiyi təlimçi Dr. Wolf-Dieter Stotz Universitetin ingilis dili müəllimləri üçün təlim keçib.

Təlimdə yaxşı dərsin elementləri, amerikan və İngiltərə ingiliscəsi, motivasiya mətnləri və effektiv qrup işi vasitəsilə tələbələrin cansıxıcılığıyla mübarizə üsulları və ümumilikdə dərslərin daha maraqlı və yaddaqalan edilməsi mövzularında müzakirələr aparılıb.

Qarşılıqlı müzakirələrlə keçirilən təlim 2 gün davam edib. Təlimin sonunda iştirakçılara sertifikatlar təqdim olunub.



# "Robotex Azərbaycan"da ADPU STEAM Mərkəzinin komandası I yerə çıxıb

Estoniyada yerləşən "Robotex" təşkilatı hər ilin noyabr ayında Estoniyanın paytaxtı Tallin şəhərində dünyanın ən böyük robototexnika festivalı olan "Robotex International"ı təşkil edir. Türkiyənin ən böyük robototexnika festivalı isə "Robotex Türkiyə"dir. "Robotex Türkiyə" texnologiya sənayesinin liderlərindən məlumat almaq, yeni startapları kəşf etmək, robotlar istehsal etmək və ən son texnologiyanı kəşf etmək üçün minlərlə mühəndis, menecer, tələbə və alimi bir araya gətirən ən böyük robototexnika festivalıdır.

2-3 mart tarixlərində ilk dəfə Bakıda "Robotex Azərbaycan Avrasiya Çempionatı" keçirilib. Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) STEAM Mərkəzinin müəllimi Xumarə Qəhrəmanlı və tələbələri Naxçıvan Dövlət Universiteti və "Robotex Türkiyə"nin birgə təşkilatçılığı, Azərbaycan Respublikasının Elm və Təhsil Nazirliyi, Azərbaycan Respublikasının İnnovasiya və Rəqəmsal İnkişaf Agentliyi, "Azercell" və "Global Olympic Center"in dəstəyi ilə keçirilən çempionatda iştirak ediblər.

ADPU-nun STEAM Mərkəzinin müəllimi Xumarə Qəhrəmanlının mentorluğu ilə tələbələrimiz 2 kateqoriyada yarışmışlar. Qızlar kateqiyasında "ADPU Girls" komandasında ADPU-nun Riyaziyyat fakültəsinin informatika müəllimliyi ixtisasının IV kurs tələbəsi Tamara Manaflı və riyaziyyat




müəllimliyi ixtisasının məzunu Türkanə Qəhrəmanlı I yerə layiq görülmüşlər. Yaşıl sahibkarlıq kateqoriyasında "Azirrigation" komandasından ADPU-nun riyaziyyat və informatika müəllimliyi ixtisasının SABAH qrupları üzrə V kurs tələbəsi Elmira Poladova isə III layiq görülüb. Hər iki komanda aprel ayında Türkiyənin Antalya şəhərində keçiriləcək "Robotex Türkiyə Çempionatı"nda iştirak haqqı qazanıb.

# ADPU-da "Ali təhsildə keyfiyyət meyarları" mövzusunda seminar keçirilib



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində Beynəlxalq əlaqələr şöbəsi və Təlim-Tədris Mərkəzinin birgə təşkilatçılığı ilə "Ali təhsildə keyfiyyət meyarları" mövzusunda seminar keçirilib. Seminarda spiker ADPU-nun Keyfiyyətin təminatı şöbəsinin müdiri, dosent Qalib Şərifov IQAinAR layihəsi çərçivəsində Mursiya Katolik Universitetinə səfər zamanı öyrənilmiş tədris, təlim və qiymətləndirmə sahəsində daxili keyfiyyət təminatı prosedurları və mexanizmləri təcrübəsini bölüşüb.

# ADPU Həmkarlar İttifaqı Komitəsinin XVIII hesabat-seçki konfransı keçirilib



Martın 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin Həmkarlar İttifaqı Komitəsinin (ADPU HİK) XVIII hesabat-seçki konfransı keçirilib.

ADPU-nun fakültələri, struktur bölmələri və filiallarında keçirilmiş hesabat-seçki yığıncaqlarında seçilmiş 197 nəfər nümayəndədən 191 nəfərinin iştirakı ilə baş tutan konfransda, əvvəlcə, Azərbaycan Respublikasının Dövlət Himni ifa olunub, Ümummilli Lider Heydər Əliyevin, vətən uğrunda canlarından keçmiş şəhidlərimizin və ötən dövrdə dünyasını dəyişən həmkarlar ittifaqı üzvlərinin xatirələri bir dəqiqəlik sükutla yad edilib.

ADPU HİK Təşkilat Komitəsinin sədri Hüseyn Hacıyevin sədrliyi, Kəmalə İsgəndərovanın katibliyi ilə keçirilən konfransda 2017-2023-cü illər ərzində görülən işlərlə bağlı hesabat məruzəsi ilə çıxış edən ADPU HİK sədri, dosent Vaqif Əliyev diqqətə çatdırıb ki, hesabat dövründə HİK tərəfindən üzvlərin əmək və sosial hüquqlarının müdafiəsi, onların müalicə və sağlamlıq imkanları ilə təmin olunması, maddi yardım və mükafatların verilməsi, eləcə də ADPU-da keçirilən mədəni-kütləvi tədbirlərə dəstək göstərilməsi istiqamətində sistemli və müntəzəm fəaliyyət icra olunub. Vurğulanıb ki, Universitet rəhbərliyi ilə bağlanan müqavilə və qurulan çevik əməkdaşlıq mexanizmləri sayəsində əməkdaşların hüquqlarının müdafiəsi sahəsində işlək ortaq mexanizm təsis edilib, müsbət mühit yaradılıb.

ADPU HİK Təftiş Komitəsinin sədri Hacər Hüseynova isə hesabat dövründə təşkilatın fəaliyyəti və universitetlə əlaqələrində şəffaflığın və çevikliyin təmin edildiyini qeyd edib.

ADPU Həmkarlar İttifaqı Komitəsinin fəaliyyətinə münasibət bildirən Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov və Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin (ATİAHİ RK) sədr müavini Mirzə Cəfərzadə təşkilatın fəaliyyətini yüksək qiymətləndiriblər.

Çıxış edənlərdən ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, professor Mahirə Hüseynova, professor Əbülfət Pələngov, professor Müseyib İlyasov, professor İramin İsayev və filiallardan gələn nümayəndələr hesabat ətrafında fikirlərini bölüşüb, yeni istiqamətlər barəsində təkliflərini səsləndiriblər.

Hesabat yekdilliklə qəbul olunub. Daha sonra ümumi səsvermə ilə ADPU HİK-nın 35 nəfərdən ibarət yeni heyəti, 3 nəfərdən ibarət Təftiş Komitəsi və 11 nəfərdən ibarət Rəyasət Heyətinin üzvləri seçilib. Dos. Vaqif Əliyev konfrans iştirakçılarının yekdil səs çoxluğu ilə yenidən ADPU HİK-ya sədr seçilib. V.Əliyev ona göstərilən etimada görə konfrans üzvlərinə təşəkkür edərək, bundan sonra da əzmlə çalışacağını diqqətə çatdırıb. Yekunda həmkarlar ittifaqı hərəkatında səmərəli fəaliyyətinə görə ADPU Həmkarlar İttifaqı Komitəsinin Təşkilat Komitəsinin sədri Hüseyn Hacıyev, baş məsləhətçisi Nigar Rəhimova və Universitetin İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin fotoqrafı Nurlan Səmədov ATİAHİ RK-nın Fəxri Fərmanı ilə təltif olunlar.

# ADPU əməkdaşının məqaləsi Avropa Birliyində "İlin ən çox oxunan 25 məqaləsi" siyahısına düşüb



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialının Ədəbiyyat və dillər kafedrasının baş müəllimi Sərxan Cəfərovun məqaləsi Avropa Birliyi ölkələrində "İlin ən çox oxunan 25 məqaləsi" siyahısına düşüb. Sərxan Cəfərov və həmkarı, Akademik Həsən Əliyev adına Coğrafiya İnstitutunun icraçı direktoru, dosent Zaur İmraninin 2023-cü ildə Xorvatiyanın yüksək impakt faktorlu, beynəlxalq indeksli "International Journal of Innovation and Economic Development" jurnalında nəşr olunmuş "Economic-Geographical Model of Sustainable Development in Manufacturing and Education" adlı elmi məqalələri 2024-cü ildə ResearchLeap - Beynəlxal Elmi-Tədqiqat Araşdırma Platforması tərəfindən aparılan qiymətləndirmədə 2023-cü il üzrə Avropa Birliyi ölkələrində ilin ən çox oxunan 25 məqaləsi siyahısına düşüb. Məlumat üçün qeyd edək ki, bu məqalə Azərbaycan təhsilində sinergetik yanaşma və inteqrativ istiqamət baxımından yeni yanaşmalardan biridir. Tədqiqatçı qeyd edir ki, bu nəticələr göstərir ki, Azərbaycan alimlərinin tədqiqatları artıq Avropa alimlərinin də diqqətini cəlb edir.

# ADPU-nun məşhur məzunlarından Rafiq Əziz və Ənvər Sadıqova Universitetin 100 illik yubiley medalı təqdim olundu



Martın 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov ali təhsil ocağının məşhur məzunlarından görkəmli rəssam, Yeddtəpə Universitetinin professoru Rafiq Əziz (Rafiq Əzizov) və tanınmış musiqiçi, Xalq artisti Ənvər Sadıqovla görüşüb.

Görüşdə, həmçinin ADPU-nun tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov və Musiqi və onun tədrisi texnologiyası kafedrasının müdiri, dosent Laçın Həsənova iştirak edib. Səmimi söhbət şəraitində keçən görüşdə qonaqlar Pedaqoji Universitetlə bağlı xatirələrini bölüşüb, ADPU-da aparılan islahatlar haqqında məlumat əldə ediblər.

ADPU-nun rektoru, prof. Cəfər Cəfərov Rafiq Əzizov və Ənvər Sadıqova "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi (1921 - 2021)" Azərbaycan Respublikasının yubiley medalını təqdim edib.

Göstərilən xoş münasibətin və illər sonra doğma universitetdə olmalarının təəssüratlarını bölüşən məşhur məzunlar ADPU-nun qonaq kitabına ürək sözlərini yazıblar. Daha sonra rektor qonaqları universitetdə aparılan yeniliklər və tədris prosesi, eləcə də ADPU-nun əsas binasının tarixi hissəsinin bu günü ilə tanış edib.

Qeyd edək ki, türk dünyasının məşhur rəssamı Rafiq Əziz uzun illərdir Türkiyədə yaşayır və fəaliyyət göstərir. O, Türkiyənin nüfuzlu Yeddtəpə Universitetinin professoru, sənətşünaslıq elmləri doktoru, Azərbaycanın Əməkdar incəsənət xadimi, Azərbaycan Rəssamlar İttifaqı və UNESCO Rəssamlar İttifaqının üzvüdür. Onun Türkiyənin dövlət muzeylərində 150-dən çox tarixi mövzuda yağlı boya əsəri var. Eyni zamanda Türkiyə Dəniz Qüvvələri Komandanlığının sənət layihələrində iştirak edən Rafiq Əzizov tarixi rəsmlərin bərpasında yaxından iştirak edir.

Tanınmış qarmon ifaçısı Ənvər Sadıqov isə Azərbaycan Respublikasının Xalq artisti və "Azərbaycan Televiziya və Radio Verilişləri" QSC-nin "Qaytağı" instrumental ansamblının bədii rəhbəridir. Eyni zamanda pedaqoji fəaliyyətlə məşğuldur.

## THİK qızlararası voleybol yarışları keçirib



Azərbaycan Dövlət Pedaqoji Universitetinin Tələbə Həmkarlar İttifaqı Komitəsinin (ADPU THİK) təşəbbüsü və təşkilatçılığı ilə 8 Mart – Beynəlxalq Qadınlar Günü münasibəti ilə fakültələr üzrə təşkil olunmuş qızlararası voleybol yarışlarının yekun mərhələsi keçirilib.

Yarışda, ümumilikdə, 9 fakültədən 10 komanda iştirak edib. 3 gün davam edən turnirin yarımfinal mərhələsi martın 5-də keçirilib. Yarımfinala 8 komanda, finala isə qarşılaşdığı bütün rəqiblərinə qalib gəlmiş 4 komanda vəsiqə qazanıb. Bunlar "Riyaziyyat", "İbtidai təhsil", "Fizika", "Kimya və biologiya" komandalarıdır.

Final oyununun yekununa əsasən, "Riyaziyyat" komandası III, "İbtidai təhsil" komandası II, "Fizika" komandası isə I yerin sahibi olub. Qalib komandalar diplomla təltif olunublar.

## Çanaqqala On Səkkiz Mart Universiteti ilə əməkdaşlıq müqaviləsi imzalanıb



Martın 11-də Türkiyənin Çanaqqala On Səkkiz Mart Universitetinin rektoru, professor Ramazan Cüneyt Erenoğlu və coğrafiya müəllimi prof. Vedat Çalışkan ADPU-nu ziyarət ediblər. Görüşdə ADPU-nun rektoru, prof. Cəfər Cəfərov, tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova və mütəxəssis Nərgiz Səfərova iştirak ediblər. Görüş zamanı tərəflər təmsil etdikləri universitetlərin tarixi, strukturu, təhsil proqramları barədə bir-birini məlumatlandırıb, universitetlər arasında əlaqələri inkişaf etdirmək, təcrübə mübadiləsi aparmaq və beynəlxalq proqramlarda və layihələrdə qarşılıqlı əməkdaşlıq etmək arzusunu ifadə ediblər. Bundan əlavə, ikili diplom proqramı sahəsində mümkün əməkdaşlıq imkanları araşdırılıb və belə əməkdaşlığın qarşılıqlı faydalı olacağı vurğulanıb. Görüşün sonunda universitetlər arasında əməkdaşlıq müqaviləsi imzalanıb və tərəflər bir-birinə xatirə hədiyyələri təqdim ediblər.

## Magistratura tələbəsi təhsilini Rumıniyada davam etdirir



ADPU SABAH qruplarının "Təlim və tədrisin təşkili və metodikası" ixtisaslaşması üzrə II tədris ilinin magistrantı Yeganə Hüseynzadə Rumıniyanın "Dunărea de Jos University of Galaţi" Universitetində Erasmus mübadilə proqramı çərçivəsində təhsilini davam etdirir.

## Elmi institut direktorları ADPU-nun 100 illik yubiley medalı ilə təltif olunub




Martın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Azərbaycan Respublikasının Elm və Təhsil Nazirliyinin bir sıra elmi institutlarının rəhbərləri ilə görüş keçirilib. Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, prorektorları Eldar Aslanov, Asəf Zamanov, Fikrət Rzayev və Kimya və biologiya fakültəsinin dekanı Reyhan Ağayeva, eləcə də Elm və Təhsil Nazirliyinin tabeliyindəki Dendrologiya İnstitutunun baş direktoru Minarə Həsənova, Akademik Abdulla Qarayev adına Fiziologiya İnstitutunun baş direktoru Ulduz Haşımova, Botanika İnstitutunun direktoru Səyyarə İbadullayeva, Polimer Materialları İnstitutunun baş direktoru Bəxtiyar Məmmədov, Mikrobiologiya İnstitutunun baş direktoru Pənah Muradov və Neft və Qaz İnstitutunun baş direktoru Fəxrəddin Qədirov iştirak edib.

Universitetin müvafiq fakültə və kafedraları ilə elmi institutlar arasında qarşılıqlı əlaqələr haqqında müzakirələr aparılıb və perspektivlər qeyd olunub.

Yekunda müvafiq elmi institut direktorlarına "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi (1921 – 2021)" Azərbaycan Respublikasının yubiley medalı təqdim olunub. Göstərilən diqqətə görə təşəkkür edən alimlər Pedaqoji Universitetin ölkəmizin təhsil sistemində oynadığı əhəmiyyətli rola diqqət çəkib, son dövrlərdə aparılan islahatların faydasını qeyd ediblər.

## Pedaqoji Universitet Bakı Biznes Universiteti ilə anlaşma memorandumu imzalayıb



Martın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Bakı Biznes Universitetinin (BBU) rəhbərliyi ilə görüş keçirilib. Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, Tədris departamentinin direktoru, dosent Sənan Əliyev, Təlim-Tədris Mərkəzinin müdiri Xalidə Həmidova, eləcə də Bakı Biznes Universitetinin rektoru, professor İbad Abbasov, tədris işləri üzrə prorektoru, dosent Xatirə Əzizova, beynəlxalq əlaqələr üzrə prorektoru, iqtisad üzrə fəlsəfə doktoru Eşqin Bayramov və Universitet-Sənaye iş birliyi şöbəsinin müdiri Gülşən Bayramova iştirak edib.

Ali təhsil ocaqlarında aparılan islahatlar, tədris-akademik və elmi inkişaf sahəsində əldə olunan nailiyyətlər və əməkdaşlıq perspektivlərinin müzakirə olunduğu görüşün sonunda ADPU və BBU arasında qarşılıqlı əməkdaşlığa dair anlaşma memorandumu imzalanıb.

Qeyd edək ki, memorandum elmi, akademik, tədris, tədqiqat sahələrində birgə layihələrin icrası, eləcə də təcrübə və akademik və tələbə heyəti mübadiləsi məsələləri üzrə əməkdaşlıq məsələlərini əhatə edir.

Görüşün sonunda qonaqlar Pedaqoji Universitetin əsas tədris binası ilə yaxından tanış olublar.

## ADPU-nun Quba filialında "Narkomaniyaya yox deyək" mövzusunda tədbir keçirilib



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialında Quba Rayon Polis Şöbəsinin təşkilatçılığı ilə "Narkomaniyaya yox deyək" devizi altında tədbir keçirilib. Tədbirdə Quba Rayon Polis Şöbəsinin rəisi, polkovnik Mehman Əliyev, rəis müavini, polis polkovnik-leytenantı Vüsal Rüstəmov, polis mayoru Orxan Şahmarov, Quba filialının direktoru, f.e.d. Yusif Alıyev və filialın müəllim və tələbə heyəti iştirak edib. Əvvəlcə, Dövlət Himni səsləndirilib, Azərbaycanın azadlığı uğrunda canlarını fəda edən şəhidlərimizin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Giriş sözü ilə çıxış edən dosent Yusif Alıyev tədbirin mahiyyəti haqqında qısa məlumat verərək, daxili işlər orqanlarının bu istiqamətdə gördüyü sistemli işlərin rayon ictimaiyyəti və gənclər tərəfindən alqışlandığını diqqətə çatdırıb.

Çıxış edən Quba Rayon Polis Şöbəsinin rəisi Mehman Əliyev gəncləri Azərbaycanın işıqlı gələcəyi naminə qoruyan Azərbaycan polisinin Quba rayonunda da apardığı məqsədyönlü fəaliyyətdən söz açıb.

Şöbənin rəis müavini, polis polkovnik-leytenantı Vüsal Rüstəmov narkotik vasitələr, psixotrop maddələrin növləri, onların insan sağlamlığına vurduğu zərərlər haqqında ətraflı məlumat verərək, gənclərimizi bu kimi amansız bəlalardan qorumağın yolunun maarifləndirmə tədbirlərindən keçdiyini vurğulayıb. Sonda tədbir iştirakçılarının sualları cavablandırılıb.

## ADPU-da Atatürk Mədəniyyət, Dil və Tarix Yüksək Qurumunun rəhbərliyi ilə görüş keçirilib




Martın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Türkiyənin Atatürk Mədəniyyət, Dil və Tarix Yüksək Qurumunun nümayəndə heyəti ilə görüş keçirilib. Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, beynəlxalq əlaqələr üzrə prorektor, professor Mahirə Hüseynova, Filologiya fakültəsinin dekanı, f.e.d. Könül Həsənova, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova, Beynəlxalq layihələr və qrantlar şöbəsinin mütəxəssisi Ülkər Abdullayeva, Atatürk Mədəniyyət, Dil və Tarix Yüksək Qurumunun rəhbəri, professor Derya Örs, Türk Tarix Qurumunun rəhbəri, professor Yüksəl Özgən, Türk Dil Qurumunun rəhbəri, professor Osman Mərd, Türkiyə Elmlər Akademiyasının rəhbəri, professor Müzəffər Şəkər və Türkiyənin Bakıdakı mədəniyyət atteşesi, professor Mühiddin Məcid iştirak ediblər.

Görüş əsnasında tərəflər təmsil etdikləri müəssisələr və gördükləri işlər barədə bir-birlərinə ətraflı məlumat verərək mümkün əməkdaşlıq imkanlarını müzakirə ediblər.

Sonda xatirə hədiyyələri təqdim edilib və qonaqlar ADPU-nun əsas tədris binası ilə tanış olublar.

## Pedaqoji Universitetdə magistrantlar üçün vebinar keçirilib




Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADU) Magistratura və doktorantura şöbəsi və şöbənin Davamlı təhsil və innovasiyalar bölməsinin birgə təşkilatçılığı ilə magistrantlar üçün "Kurikulumda yeni yanaşmalar rəqabətqabiliyyətli kadr hazırlığının əsas faktorlarından biri kimi" mövzusunda vebinar keçirilib.

İştirakçıları salamlayan şöbənin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov bildirilib ki, vebinar müxtəlif ixtisaslaşmalar üzrə təhsil alan magistrantların təhsil sahəsində olan yenilikləri öyrənməyə marağını nəzərə alaraq təşkil edilib. Bununla yanaşı, sürətlə dəyişən və inkişaf edən müasir dünyada yeni bacarıqlara yiyələnmənin əhəmiyyətindən, onun üstünlüklərindən bəhs edilib.

Şöbənin baş mütəxəssisi Dilguşə Süleymanovanın təqdimatında keçirilən vebinarda mövcud kurikulumlarda olan yeniliklər və dəyişikliklər, onların təhsilalanlara təsiri, hazırda təhsil alan tələbələri qarşıda gözləyən perspektivlər və təhsilin əhəmiyyəti kimi məsələləri əhatə edən vacib məsələlərə toxunulub. Bildirilib ki, son illərdə bir çox ölkələrdə təhsil sistemi təkmilləşdirilib, yenilənib, müasir tələblərə uyğun proqramlar tətbiq olunub. Bu dəyişikliklər ictimai və iqtisadi inkişafın tələblərinə uyğunlaşmağı, texnologiyalardan daha yaxşı istifadə etməyi və müasir təhsil standartlarına uyğunluğu ehtiva edir.

Son illərdə elm və təhsil naziri, ali məktəb rəhbərləri, ziyalılar və digərlərinin çıxışlarında rəqabətqabiliyyətli rəqəmsal dövrün tələblərinə uyğun kadr hazırlığının vacibliyinə diqqət yetirilir. Bu baxımdan, təqdimatda təhsil proqramlarında ifadə olunan təhsilin məzmunu, onun müasir tələblərə uyğun təşkili, qiymətləndirilməsi ilə bağlı vacib məqamlar vurğulanıb. Yeni proqramın nəzərdə tutulan 3 bölməni – hüquqi savadlılıq, fənn kurikulumlarının tətbiqi və pedaqoji-psixoloji kompetensiyaları əhatə etdiyi diqqətə çatdırılıb, XXI əsr bacarıqları, təfəkkürün növləri, tərzləri, formaları barədə də faydalı məlumatlar təqdim olunub.

## ADPU-nun Quba və Şamaxı filialının müəllimlərii "Heydər Əliyevin 100 illiyi (1923-2023)" yubiley medalı ilə təltif edilib



ADPU-nun Quba filialının Humanitar elmlər kafedrasının müəllimi Orucova Elza Qədir qızı və Şamaxı filialının Sosial və xüsusi fənlər kafedrasının müdiri, dosent Alıcanov Mayıl Sədyar oğlu Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 2 fevral 2024-cü il tarixli 4289 nömrəli Sərəncamı ilə "Heydər Əliyevin 100 illiyi (1923-2023)" Azərbaycan Respublikasının yubiley medalı ilə təltif ediliblər.

Onlar ictimai-siyasi və təhsil sahəsindəki uzunmüddətli səmərəli fəaliyyətlərinə görə bu yüksək təltifə layiq görülüblər.

# ADPU-da Novruz bayramı şənliyi keçirilib

Martın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Tələbə Həmkarlar İttifaqı Komitəsinin (THİK) təşkilatçılığı ilə Novruzun gəlişinə həsr olunmuş "Yurduma ilk bahar gəlir" adlı bayram şənliyi keçirilib.

Bayram şənliyində ADPU-nun rəhbərliyi, müəllim və tələbələri iştirak ediblər. Tədbir Dövlət Himninin səsləndirilməsi və vətən uğrunda canından keçmiş şəhidlərimizin ruhlarının bir dəqiqəlik sükutla yad edilməsi ilə açıq elan olunub. Bədii hissə ilə başlayan tədbirdə "Arşın mal alan" filmindən "Toy" səhnəciyi və "Keçəlin toyu" səhnəciyi təqdim olunub. ADPU THİK rəqs qrupunun müxtəlif nömrələri, Riyaziyyat fakültəsinin IV tədris ili tələbəsi Dilarə Abdullazadə, Kimya və biologiya fakültəsinin III tədris ili tələbəsi Fəridə Əliyeva, eləcə də Universitetin məzunu Nəzrin Hüseynovanın, "Aynaband" qrupu və İlkin Fuadın ifaları tədbirə xüsusi rəng qatıb. Kosa ilə keçəlin sərgüzəştləri tələbə və müəllimlərə şən anlar yaşadıb.



## Tələbə təşkilatları silsilə tədbirlər həyata keçirirlər



Martın 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) fəaliyyət göstərən tələbə təşkilatları tərəfindən bir neçə maraqlı tədbir həyata keçirilib.

ADPU Təhsil Könüllüləri Tələbə Birliyinin təşkilatçılığı ilə baş tutan rəsm və piano dərsləri, "Dahilər unudulmur" adlı intellektual oyun, ADPU YENİ Klubun təşkilatçılığı ilə təşkil olunan işarə dili seminarı və "Film qalaktikası" adlı intellektual oyun bunlara misal ola bilər.

Qeyd edək ki, Universitetdə tələbələrin asudə vaxtlarını səmərəli keçirmələrinə və ictimai-sosial inkişaflarına dəstək göstərmək məqsədi ilə hər həftəsonu mütəmadi olaraq bu qəbildən müxtəlif layihələr icra olunur.

## ADPU Gənc Məzunlar Assosiasiyası psixoloq Günel Muradova ilə görüş keçirib



Azərbaycan Dövlət Pedaqoji Universiteti Gənc Məzunlar Assosiasiyasının (ADPU GMA) təşəbbüsü ilə Universitetin Məktəbəqədər təhsil fakültəsində psixoloq Günel Muradova ilə görüş təşkil olunub. Tədbirdə fakültə dekanı, dosent Nailə Hüseynova, Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli və Psixologiya klubunun fəalları iştirak edib.

Dekan Naile Hüseynova çıxış edərək tələbələr üçün bu tip görüşlərin vacibliyini qeyd edib və növbəti günlərdə də fakültədə forum və müxtəlif görüşlərin keçiriləcəyini diqqətə çatdırıb.

Daha sonra psixoloq Günel Muradova posttravmatik stress pozuntusu, onun əlamətləri və müalicə planı, koqnitiv işlənmə və yazılı ekspozisiya terapiyası barədə tələbələrə məlumat vermiş, mövzu ətrafında fikir mübadiləsi aparılmışdır. Ekspert, Azərbaycan Respublikası Səhiyyə Nazirliyi tərəfindən bu istiqamətdə ölkəmizdə tətbiq olunan yeniliklərdən danışmışdır. Sonda "For Azerbaijan" Beynəlxalq Təşkilatının "Paşa Sığorta"nın maliyə dəstəyi və İcbari Tibbi Sığorta üzrə Dövlət Agentliyinin tərəfdaşlığı ilə həyata keçirdiyi "Azərbaycanda Psixoloji Reabilitasiya İmkanlarının Artırılması (APRİA)" layihəsi çərçivəsində hazırlanmış "PTSP hallarında yazılı ekspozisiya terapiyası" kitabı tələbələrə hədiyyə edilib.

Qeyd edək ki, Günel Muradova bakalavr təhsilini ADPU-nun Kimya və biologiya fakültəsində, magistr təhsilini isə Birləşmiş Krallığın Liverpul Universitetində psixi sağlamlıq psixologiyası ixtisası üzrə alıb. Həmçinin, Azərbaycan Psixiatriya Assosiasiyasının üzvü, Ümumdünya Səhiyyə Təşkilatının layihələrində ekspert, psixi sağlamlıq və psixososial dəstək üzrə beynəlxalq dərəcəli təlimçidir. Koqnitiv İşlənmə Terapiyası və Yazılı Ekspozisiya Terapiyası üzrə lisenziyalı psixoterapevtdir. Fəaliyyəti ərzində Kolumbiya Universiteti, Ankara İldırım Bəyazid Xəstəxanası, Kraliça Marqaret Universiteti, Harvard Universitetində təlimlərdə iştirak edib. Hazırda Azərbaycan Kapoeyra Federasiyasının prezidenti və Səhiyyə Nazirliyinin Psixi Sağlamlıq Mərkəzinin klinik psixoloqudur.

## Yeni tələbə klubları fəaliyyətə başlayıb




ADA Universitetinin tərəfdaşlığı ilə Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Kosmos klubu yaradılıb. Tələbə klubu ADPU-da Təhsil Könüllüləri Tələbə Birliyinin nəzdinə, ADA Kosmos klubu və Qalaktika Cəmiyyəti ilə birgə fəaliyyət göstərəcək. Azərbaycanın 10 universiteti, Azərkosmos və Şamaxı Astrofizika Rəsədxanası ilə yenicə əməkdaşlıq edən qlobal Qalaktika Cəmiyyəti artıq azərbaycanlı tələbələr, şagirdlər və elm həvəskarları üçün çağırış edir. Cəmiyyət ADA Universitetində təcrübə proqramı, "Qalaksi" görüşündə (ABŞ, 2026) iştirak şansı, karyera inkişafı, elmi məqalə dərci, beynəlxalq sertifikatlar, konfranslar, yarışlar, olimpiadalarda iştirak və s. kimi 35 xidmət növünü özündə birləşdirir.

Azərbaycan Kibertəhlükəsizlik Təşkilatları Assosiasiyası və Pedaqoji Universitet arasında əməkdaşlıq çərçivəsində Universitetin, əsasən, riyaziyyat müəllimliyi, riyaziyyat və informatika müəllimliyi ixtisaslarında təhsil alan, eyni zamanda İKT sahəsinə həvəsi və bacarığı olan tələbələrinin İT üzrə peşəkar inkişafına dəstək olmaq və şəbəkələşmə prosesinə təkan vermək məqsədilə ADPU-da Kiber klub yaradılıb.

Qeyd edək ki, klub həm də digər ali təhsil müəssisələri ilə təcrübə mübadiləsi vasitəsilə gənclər arasında körpü rolunu oynayacaqdır.

ADPU-da yeni fəaliyyətə başlayan digər klub isə Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqı (ATGTİ) və Azərbaycan Respublikası Mədəniyyət Nazirliyinin birgə layihəsi əsasında ADPU TGT nəzdində yaradılan "CreART" könüllü mədəniyyət klubudur. Klub mütəmadi olaraq tələbələr üçün film nümayişləri və ekskursiya tipli layihələr həyata keçirməklə onlarda estetik təfəkkürün formalaşmasına töhfə verməyi hədəfləyir.

## ADPU-nun prorektoru regional konfransda "Məktəb öyrənən təşkilat kimi" mövzusunda təqdimat edib




"Müasir təhsil paradiqmasında məktəblər təkcə biliyi ötürmür, həm də öz daxili dinamikası ilə öyrənən və inkişaf edən canlı sistemlər kimi fəaliyyət göstərir." - bu fikirləri Lənkəranda keçirilən "Təhsildə yeni çağırışlar" ilk regional konfransında "Məktəb öyrənən təşkilat kimi" mövzusunda təqdimat edən Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva səsləndirib.

Təqdimatda məktəblərin özünü daim yeniləyən və təkmilləşdirən qurum kimi necə formalaşdıra biləcəyinə dair əsas prinsiplər və təcrübələr müzakirə olunub. Qeyd olunub ki, təhsil müəssisələrinin öyrənən təşkilatlar kimi layihələndirilməsi və fəaliyyət göstərməsi üzləşdiyimiz sürətli sosial-iqtisadi dəyişikliklərə uyğunlaşmaq və öyrənənlərə çağımızın gözləntilərinə uyğun bacarıqlar vermək baxımından mühüm əhəmiyyət kəsb edir. Bu kontekstdə tədris prosesini idarə edənlərin, müəllimlərin və tələbələrin iştirak etdiyi davamlı inkişaf prosesi və bu prosesdə hər bir fərdin həm öyrənən, həm də müəllim kimi rolunun vacibliyi vurğulanıb.

Prorektor məktəbin biliyin kəşfi və innovasiya proseslərindəki fəal rolunun öyrənmə təcrübələrini daha maraqlı və effektiv etdiyini göstərən akademik araşdırmaların nəticələrini paylaşaraq, şəxsi və peşəkar inkişaf, təlim strategiyaları və liderlik təcrübələrinin məktəbin öyrənən təşkilata çevrilmə yolunda necə transformativ təsir yarada biləcəyini nümunələr əsasında izah edib. Bildirilib ki, bu tədris rəhbərləri, müəllimlər, şagirdlər və bütün təhsil tərəfdaşlarının birgə səylərini tələb edir.

Qeyd edək ki, 400-ə yaxın təhsil işçisinin qatıldığı konfransda MÜTDA-nın direktor müavini Mehriban Valiyeva, Lənkəran-Astara Regional Təhsil İdarəsinin müdiri Bəhruz Mehdiyev, ADPU-nun prorektoru Könül Pirverdiyeva, Qazi Universitetinin müəllimi, professor Necati Cemaloğlu, "Azərbaycan məktəbi" jurnalının baş redaktoru Arzu Soltan, "T-Network" platformasının rəhbəri Cəfər Mənsimi çıxış ediblər.

Konfransdan sonra "Direktorlar klubu"nun üzvü olan Lənkəran-Astara Regional Təhsil İdarəsinin tabeliyindəki məktəblərin bir sıra direktorları ilə görüş keçirilib. Görüşdə direktorlarla məktəbdə liderlik və səmərəli ünsiyyət, müasir idarəetmə modelləri və tədrisin səmərəli təşkili mövzularında müzakirələr aparılıb, bir sıra mühüm çağırışlar səsləndirilib.

Xatırladaq ki, "Direktorlar klubu" elm və təhsil naziri Emin Əmrullayevin təşəbbüsü ilə yaradılıb.

## Pedaqoji Universitet Laçındakı "Simurq" kitabxanasına kitablar hədiyyə edib



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kitabxana-İnformasiya Mərkəzi Laçın şəhərindəki "LaCinema" kinoteatrının nəzdində fəaliyyət göstərən "Simurq" kitabxanasına 27 Mart - Elm Günü münasibətilə 250 nüsxə kitab hədiyyə edib.

Hədiyyə olunan kitablar arasında Unu Öndər Heydər Əliyevin və Prezident, Müzəffər Ali Baş Komandan İlham Əliyevin zəngin fəaliyyətlərinin müxtəlif aspektlərini əks etdirən kitablar, Vətən müharibəsi şəhidləri ilə bağlı ensiklopedik nəşrlər, ADPU-nun yubiley nəşrləri, eləcə də universitetin professor-müəllim heyətinin elmin müxtəlif sahələrinə aid əsərləri və dərslikləri yer alır.

Yola salınmazdan əvvəl Universitetin Kitabxana-İnformasiya Mərkəzində toplanan kitabların sərgisi təşkil olunub. ADPU-nun rektoru, professor Cəfər Cəfərov, elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Kitabxana-İnformasiya Mərkəzinin direktoru Zinhara Həsənova və ADPU-nun Gənc Alimlər və Tədqiqatçılar Şurasının sədri İlkin Əsgərov sərgiyə baxış keçiriblər.

Qeyd edək ki, cari ilin fevralın 4-də istifadəyə verilmiş kitabxana Laçına yeni köçmüş sakinlərin təşəbbüsü ilə görkəmli maarifçi, yazıçı Tağı Şahbazi Simurğun şərəfinə "Simurq" adlandırılıb.

## ADPU-da Çanaqqala Zəfərinin ildönümü münasibətilə bədii tədbir keçirilib



Martın 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqı (ATGTİ) və Bakı İstanbul Liseyinin dəstəyi, ADPU Gənc Məzunlar Assosiasiyası (ADPU GMA) və ADPU Tələbə Gənclər Təşkilatının (ADPU TGT) təşkilatçılığı ilə Çanaqqala Zəfərinin 109-cu ildönümünə həsr olunmuş "Geri Dönməyi Düşünmədilər" adlı bədii tədbir keçirilib.

Əvvəlcə, vətən uğrunda canından keçən şəhidlərin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Azərbaycan Respublikasının Dövlət Himni və Türkiyə Respublikasının İstiqlal Marşı səsləndirilib.

Açılış sözü ilə çıxış edən Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov qeyd edib ki, 18 mart 1915-ci il nəinki Türkiyənin, ümumilikdə türk və islam dünyasının tarixinə qanla yazılmış şərəfli bir tarix, dünya tarixinin gedişini dəyişdirən misilsiz qəhrəmanlıq nümunəsidir.

Vurğulanıb ki, Çanaqqalada bütün türk xalqlarının nümayəndələri, eləcə də, azərbaycanlılar da əzmlə savaşıb və bu döyüşlərdə 3000 nəfər soydaşımız da qəhrəmancasına şəhidlik zirvəsinə ucalıb. Ötən il Prezident İlham Əliyevin təşəbbüsü ilə Çanaqqala Şəhidliyi Kompleksi ərazisində Azərbaycan şəhidlərinin xatirə abidəsinin açılış olub. Bu bir daha Türkiyə və Azərbaycan dövlətləri və xalqlarının nə qədər sıx tellərlə bir-birinə bağlı olduğunu göstərir.

Çıxış edən Bakı İstanbul Liseyinin Türk bölməsinin rəhbəri Səid Örbeyi 18 mart gününün mahiyyəti haqqında danışaraq Çanaqqalanın vətən və millət sevgisinin zirvəsi, dünyanı heyrətə gətirən mübarizə rəmzi olduğunu diqqətə çatdırıb və İstiqlal Marşından bir hissəni səsləndirib.

Çanaqqala Zəfəri ilə bağlı videoçarxın təqdimatından sonra Bakı İstanbul Liseyinin şagirdlərinin hazırladığı xor nümayiş olunub. Savaşın detallarını və özündə türklərin qələbələrini əks etdirən, işğalçı qüvvələrdən olan əsgərə aid məktub Bakı İstanbul Liseyinin müəllimi Hakan Köse tərəfindən səsləndirilib.

Tədbirin gedişində Bakı İstanbul Liseyinin şagirdləri və Azərbaycan Dövlət Pedaqoji Universitetinin tələbələri Mustafa Kamal Atatürkün "Güc, cəsarət, igidlik, və zərafət timsalı" olaraq qiymətləndirdiyi milli türk folklor nümunəsi olan zeybək rəqsinin müxtəlif növlərini nümayiş etdiriblər.

Bakı İstanbul Liseyinin şagirdlərinin hazırladığı "Son qala Çanaqqala" adlı oratoriyanın nümayiş olunması ilə tədbir başa çatıb.

## ADPU-da Elm Günü universitet Elmi Şurasının xüsusi iclası ilə qeyd olundu



Martın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının Elm Gününə həsr olunmuş xüsusi iclası keçirilib.

Əvvəlcə, Universitetin foyesində ADPU əməkdaşlarının elmi araşdırmalarının nəticələrinin əks olunduğu kitab sərgisinə baxış keçirilib.

İclası giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov Elm Gününün qeyd olunmasının əhəmiyyətini qeyd edib, əməkdaşları təbrik edib. Rektor, ADPU-nun professoru, fil.e.d. Leyla Vəzirovaya Ankarada yerləşən Türk Dünyası Araşdırmaları Beynəlxalq Elmlər Akademiyasının həqiqi üzvü seçilməsi haqqında diplom və qurumun "Beynəlxalq Qızıl Ulduz" medalını, əməkdaşlardan p.ü.f.d. Dayanət Musayevə dosent attestatını, Cəlilabad filialının direktoru, dosent Xudayar Sultanlıya isə 60 illik yubileyi münasibətilə ADPU rəhbərliyi və ADPU Həmkarlar İttifaqı Komitəsinin fəxri fərmanlarını təqdim edib.

Daha sonra elm və innovasiyalar üzrə prorektor, prof. Asəf Zamanov 27 Mart - Elm Günü münasibəti ilə "ADPU-nun 2023-cü il ərzində elmi və elmi-təşkilati fəaliyyəti barədə hesabat"ı təqdim edib. Hesabatda Pedaqoji Universitetdə ötən bir il ərzində elmi-təşkilati sahədə icra olunan genişmiqyaslı fəaliyyət, əldə olunan uğurlar, əməkdşaların elmi-tədqiqat nəticələrinin praktik tətbiqi və beynəlxalq elmmetrik bazalarda əks olunması məsələlərinə toxunulub.



Prof. Asəf Zamanov, xüsusilə vurğulayıb ki, Elm Gününə həsr olunmuş Elmi Şuranın iclasında müzakirə olunacaq bütün məsələlər də Pedaqoji Universitetdə elmi və elmi-təşkilati fəaliyyətə aiddir.

Belə ki, Şurada, müvafiq olaraq, magistr dissertasiya işlərinin mövzuları və elmi rəhbərlərin təsdiqi, Ümummilli Lider Heydər Əliyevin 101 illik yubileyi və 27 Mart - Elm Günü münasibətilə ADPU-da "İlin gənc alimi və tədqiqatçısı müsabiqəsi"nin elan olunması, Ümummilli Lider Heydər Əliyevin 101 illik yubileyinə həsr olunmuş ADPU tələbələrinin fizika, riyaziyyat, informatika, kimya, biologiya, Azərbaycan dili, Azərbaycan coğrafiyası, Azərbaycan tarixi, ingilis dili olimpiadaları və təsviri incəsənət müsabiqələrinin keçirilməsi, "Yaşıl təhsil" Respublika elmi-praktik konfransının təşkili, monoqrafiyaların nəşrinə icazə verilməsi və dosent elmi adının verilməsi üçün Ali Attestasiya Komissiyası qarşısında vəsadət qaldırılması haqqında qərarlar qəbul olunub.

## Cəlilabadda şagird və tələbələrlə görüş keçirilib



Regionlara baş tutan təhsil səfəri çərçivəsində Cəlilabadda şagird və tələbələrlə görüş keçirilib. Tədbirin keçirilməsində məqsəd peşə təhsilinə marağın artırılması, tam orta təhsil pilləsində tədrisin keyfiyyətinin yüksəldilməsi, bununla yanaşı, regionlarda pedaqoji ixtisaslara olan tələblər, şagirdlərin peşə seçimi istiqamətində ümumi müzakirələrin aparılmasıdır.

Açılış nitqi ilə çıxış edən Lənkəran-Astara Regional Təhsil İdarəsinin müdiri Bəhruz Mehdiyev və ADPU-nun Cəlilabad filialının direktoru, dosent Xudayar Sultanlı qonaqları salamlayıb, regionda şagirdlər üçün təhsil imkanları və son illərdə aparılan islahatlar, eləcə də bu bölgədə Pedaqoji Universitetin filialının fəaliyyətinin rolu haqqında danışıblar. Çıxış edənlərdən Məktəbəqədər və Ümumi Təhsil üzrə Dövlət Agentliyinin (MÜTDA) direktor müavini Mehriban Vəliyeva təhsildə maarifçilik missiyası, MÜTDA-nın Ümumi təhsilin təşkili şöbəsinin müdir müavini Nurlan İsmayılbəyli Müəllimlərin İşə Qəbulu (MİQ) imtahanlarının nəticələri haqqında məlumat verib, çıxışlar ətrafında zəruri müzakirələr aparılıb. Tədbirdə təqdimat edən ADPU-nun strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva şagirdlərin gələcək üçün praktik bacarıqlara yiyələnmələri, müəllimlik ixtisasının prestiji və müəllimlikdə peşə inkişafı, vəzifə yüksəlişindən söhbət açıb, həmçinin tələbələrin MİQ imtahanlarında göstərdikləri nəticələrin yüksəldilməsi və peşəkar müəllim hazırlığında diqqət edilməli məqamlara toxunub.



Ümumən, çıxışlarda ucqar regionlarda, o cümlədən cənub bölgəsinin rayonlarında müəllim kadrlarına olan tələbat və bəzi yerlərdəki müəllim çatışmazlığı diqqətə çatdırılaraq, tədbirdə iştirak edən pedaqoji ixtisaslarda təhsil alan tələbələrə region məktəblərindəki iş imkanlarını dəyərləndirmələri və bununla bağlı stimullaşdırıcı tədbirlər haqqında çağırışlar edilib.

Qeyd edək ki, tədbirdə 400-dən çox məktəbli, 200-dən çox tələbə iştirak edib.

## ADPU-nun Şəki filialının yeni direktoru kollektivə təqdim olunub





Martın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şəki filialının yeni direktoru, dosent Vurğun Məmmədov kollektivə təqdim olunub. Yeni direktoru kollektivə ADPU-nun tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, ümumi işlər üzrə prorektoru Tural Cəlilov və rektorun müşaviri Ümid Mehdiyev təqdim ediblər. Tədbirdə filialın elmi-pedaqoji heyəti, eləcə də bundan əvvəl filiala rəhbərlik etmiş dosent Rafiq Rasulov və direktor vəzifəsini müvəqqəti icra edən, dosent Nurəli Çələbiyev iştirak edib. Qeyd edək ki, elm və təhsil naziri Emin Əmrullayevin müvafiq əmrinə əsasən ADPU-nun Şəki filialına direktor təyin olunan Vurğun Rəhim oğlu Məmmədov 12 dekabr 1971-ci il tarixində anadan olub. 1993-1997-ci illərdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin Tarix fakültəsində təhsil alıb, 1997-1999-cu illərdə Ümumi tarix ixtisaslaşması üzrə magistratra təhsili alıb. 2010-cu ildə "XIX əsrin sonu, XX əsrin əvvəllərində Azərbaycanın yazıçı və maarifçilərinin əsərlərində xalq məişətinin əksi (Ü.Hacıbəyov və Ə.Haqverdiyev)" mövzusunda dissertasiya müdafiə edərək tarix üzrə fəlsəfə doktoru elmi dərəcəsi alıb. 2000-ci ildən ADPU-nun Azərbaycan tarixi kafedrasında işləyir və hazırda kafedranın dosentidir. V.Məmmədov, həmçinin 2003-2024-cü illərdə Pedaqoji Universitetin Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri kimi fəaliyyət göstərib. Mərasimdən sonra filialda və regionda uzun müddət səmərəli elmi-təşkilati və pedaqoji fəaliyyətlərinə görə bir qrup əməkdaşa "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi (1921-2021)" yubiley medalı təqdim olunub. O cümlədən, Alqoritmika şirkəti tərəfindən təşkil olunan "Proqramlaşdırma dili I (Python)" təlim kursunu uğurla bitirən filial əməkdaşlarına sertifikatlar verilib.

## Fizika fakültəsinin məzunları 50 il sonra ADPU-da bir araya gəldilər



Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Fizika fakültəsinin 1974-cü il məzunları ilə görüş keçirilib.

ADPU-nun Məzun Koordinasiya və Karyera şöbəsinin müdiri Könül Əsgərova və Fizika fakültəsinin dekan müavini, dosent Xankişi Məmmədov məzunları qarşılayaraq, universitetdə və fakültədə aparılan işlər haqqında ümumi məlumat veriblər.

Pedaqoji Universitetin elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov da 50 ilin məzunları ilə görüşərək, onları maraqlandıran sualları cavablandırıb, elmi-tədqiqat işləri haqqında məlumat verib.

Tədris departamentinin direktoru, dos. Sənan Əliyev son illərdə tədris sahəsində həyata keçirilən yeniliklər haqqında məlumat verib.

Sonra məzunlardan Nizami Əhmədov, Mahir Sarıyev, Sabir Şabanov, Ağaxəlil Əliyev və Əziz Babayev tələbəlik illərinin xatirələrindən söz açıblar.

Daha sonra məzunlar üçün ADPU-nun yenilənmiş Kitabxana-İnformasiya Mərkəzi ilə tanışlıq təşkil olunub. Mərkəzin direktoru Zinharə Həsənova burada tələbələrə göstərilən elektron xidmərlər haqqında məlumat verib.

Təhsil aldıqları auditoriyaları gəzərkən ötən illərini bir daha xatırlayan 50 il öncənin məzunları doğma universitetlərindən xoş xatirələrlə ayrılıb.

## Pedaqoji Universitetdə "Mən rəhbər olsam 4" layihəsi keçirilib



Martın 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika fakültəsində "Mən rəhbər olsam 4" layihəsi keçirilib. Layihə çərçivəsində fəal tələbələr fakültəyə bir günlük rəhbərlik ediblər.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov, sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, fakültənin dekanı Arzu Daşdəmirov və Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli tələbələrin uyğun vəzifələr üzrə iş fəaliyyətlərini müşahidə edib, "tələbə rəhbər"lərlə müzakirələr aparıblar.

Qeyd edək ki, layihə çərçivəsində tələbələr arasında keçirilən səsvermənin nəticələrinə əsasən səs çoxluğu ilə Nərmin Həsənova dekan, Orxan Məmmədli dekan müavini, Nərmin Əlihəsənova Ümumi fizika kafedrasının müdiri, Səma Şahverdiyeva Fizikanın tədrisi texnologiyası kafedrasının müdiri, Aydan Quliyeva STEAM Mərkəzinin direktoru, Qərətel Məsimova Əməyin texnologiyası kafedrasının müdiri vəzifəsinə, Ceyhun Şəkərov, Afət Əsgərli, Yavər Cavadzadə, Aysun Kərimova və Zilan Bağırzadə isə tütor vəzifəsinə seçiliblər.

Tələbələr bir iş günü ərzində müvafiq vəzifələri icra ediblər.

## ADPU-nun Ağcabədi filialının əməkdaşları təltif olunublar



Martın 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rəhbərliyi Universitetin Ağcabədi filialının əməkdaşları ilə görüşüblər. Görüşdə Pedaqoji Universitetin tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, ümumi işlər üzrə prorektoru Tural Cəlilov və rektorun müşaviri Ümid Mehdiyev iştirak edib.

Əvvəlcə, dərs prosesi və filialın infrastrukturu ilə tanışlıq olub. Filialın direktoru, dos. Mobil Məcidov qonaqları salamlayaraq Ağcabədi filialında aparılan islahatlar və əldə olunan uğurlar barədə məlumat verib.

Çıxış edən ADPU-nun tədris işləri üzrə prorektoru, dos. Eldar Aslanov filial əməkdaşları ilə görüşdən məmnunluq ifadə edərək, Azərbaycan Dövlət Pedaqoji Universitetinin tarixi, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin müvafiq Sərəncamına əsasən 2021-ci ildə ADPU-nun 100 illik yubileyinin böyük coşqu ilə keçirilməsindən danışıb. Qeyd olunub ki, Azərbaycan Respublikasının elm və təhsil naziri cənab Emin Əmrullayevin müvafiq əmrinə əsasən Pedaqoji Universitetin bir qrup əməkdaşı "Azərbaycan Respublikasının Qabaqcıl təhsil işçisi" döş nişanı, "Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyinin Fəxri Fərmanı" və "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi (1921-2021)" yubiley medalı ilə təltif olunmuşlar ki, onların sıralarında ADPU-nun Ağcabədi filialının əməkdaşları da var.

Əmrə əsasən filial əməkdaşlarından dos. Baxış Ələsgərov və dos. Sahib Zeynalov "Azərbaycan Respublikasının Qabaqcıl təhsil işçisi" döş nişanı, dos. Seymur Süleymanov "Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyinin Fəxri Fərmanı", dos. Mahir Səlimov, dos. Əliqulu Hümmətov, dos. Vaqif Allahverdiyev, dos. Yaqub Səmədov, t.ü.f.d., baş müəllim Əlizadə Nəcəfov və p.ü.f.d., baş müəllim Tahir Kərimli isə "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi (1921-2021)" yubiley medalı ilə təltif olunublar.

Görüşdə müvafiq təltiflər filial əməkdaşlarına təqdim olunub.

## ADPU THİK 31 Mart soyqırımına həsr olunmuş esse müsabiqəsi keçirib



Martın 30-da Azərbaycan Dövlət Pedaqoji Universiteti Tələbə Həmkarlar İttifaqı Komitəsinin (ADPU THİK) nəzdində fəaliyyət göstərən Gənc Yazarlar Klubunun təşkilatçılığı ilə tələbələr arasında 31 Mart - Azərbaycanlıların Soyqırımı Gününə həsr olunmuş esse müsabiqəsi keçirilib.

Esse müsabiqəsinin keçirilməsində məqsəd tələbələrdə vətənpərvərlik ruhunu gücləndirmək, onları tariximizi dərindən öyrənməyə təşviq etmək və tarixi həqiqətlərə ictimai münasibət sərgiləmə mədəniyyətinin inkişafına dəstək olmaqdır. Müsabiqəyə təqdim olunan esselərin qiymətləndirilməsi Gənc Yazarlar Klubunun yaratdığı komissiya tərəfindən həyata keçirilib. Esse müsabiqəsinin nəticələri 31 mart tarixində ADPU THİK-nın rəsmi sosial media platformaları vasitəsi ilə elan olunub. Aprel ayının 4-də qaliblərin mükafatlandırılması mərasimi keçirilib.

## ADPU-nun Quba filialı və TAİB-nin təşkilatçılığı ilə elmi-praktik konfrans keçirilib



Türk Ağsaqqalları İctimai Birliyi (TAİB) və Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialının birgə təşkilatçılığı ilə "31 Mart – Azərbaycanlıların Soyqırımı: Qanlı faciədən şanlı Zəfərə" mövzusunda elmi-praktik konfrans keçirilib. Konfransda TAİB İdarə Heyətinin üzvləri, tanınmış ziyalılar, filialın rəhbərliyi, professor-müəllim və tələbə heyəti iştirak edib.

Konfrans iştirakçıları tədbirdən öncə Ulu Öndər Heydər Əliyevin Quba şəhərindəki abidəsini, daha sonra isə Quba Şəhidlər Xiyabanı və Quba Soyqırımı Memorial Kompleksini ziyarət ediblər.

Pedaqoji Universitetin Quba filialının akt zalında keçirilən konfransda, əvvəlcə, Ulu Öndər Heydər Əliyevin, soyqırımı qurbanlarının və şəhidlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Açılış nitqi ilə çıxış edən ADPU-nun Quba filialının direktoru, fizika elmləri doktoru Yusif Aliyev konfransın tarixi əhəmiyyətini diqqətə çatdıraraq onun artıq bir ənənəyə çevrildiyini qeyd edib. Direktor daha sonra Azərbaycan xalqının başına gətirilən müsibətlərdən söz açıb, tarixi faktları qarşılaşdırıb, sistemli təhlil verib.

Konfransda məruzə edən TAİB-nin sədri, YAP Veteranlar Şurasının üzvü, tibb elmləri doktoru, akademik Sudeif İmamverdiyev Ulu Öndər Heydər Əliyevin Azərbaycan xalqı qarşısında xidmətləri və 31 Mart - Azərbaycanlıların soyqırımına hüquqi, siyasi və tarixi qiymətin verilməsindəki rolundan danışıb.

Filialın Ədəbiyyat və dillər kafedrasının müəllimi Kəmalə Bayramovanın moderatorluğu ilə davam edən konfransda, Quba RİH başçısının müavini Səidə Abasova, Azərbaycan Dövlət Akademik Musiqili Teatrının direktoru, Əməkdar incəsənət xadimi Əliqismət Lalayev, TAİB-nin Qadınlar Şurasının sədri, tarix elmləri doktoru Güllü Yoloğlu, şuranın sədr müavini Sara Göyçəli, AYB-nin Quba bölməsinin sədri, görkəmli şair Ramiz Qusarçaylı, ADPU-nun Quba filialının Ədəbiyyat və dillər kafedrasının baş müəllimi, Qabaqcıl təhsil işçisi Rahib Sədullayev, Tələbə Gənclər Təşkilatının sədri Elgün Rüstəmli mövzu ətrafındakı çıxışlarında bildiriblər ki, Ümummilli Liderimiz Heydər Əliyevin ölkəmizdə ali hakimiyyətə qayıdışından sonra mart soyqırımına dövlət səviyyəsində siyasi-hüquqi qiymət verildi. Vurğulanıb ki, Müzəffər Ali Baş Komandan cənab İlham Əliyevin rəhbərliyi ilə zəfərlə bitən Vətən müharibəsində ermənilərin iki əsrlik əsassız iddialarının boşa çıxması, əzəli torpaqlarımızın işğaldan azad edilməsi haqqın qələbəsi, xalqımıza qarşı törədilmiş soyqırımlara tutarlı cavabdır. Konfransda, həmçinin filialın tarix müəllimliyi ixtisasının tələbəsi Günəş İskəndərov özünün qələmə aldığı "Şəhidlər" şeirini səsləndirib.

Elmi-praktik konfransın sonunda TAİB-nin sədri, akademik Südeif İmamverdiyev ADPU-nun Quba filialında son bir ildə görülən işlərə də diqqət çəkərək bildirib ki, filial haqiqi mənada yüksək uğurlara imza atır, yeni yaradılan mərkəzlər və maddi-texniki bazanın yenilənməsi də buna əyani sübutdur. Sevindirici haldır ki, bütün bu görülən işlər bölgələrdə ali təhsilin səviyyəsinin yüksək olduğuna dəlalət edir.

Daha sonra filialın Elmi Şurasının qərarı ilə türk xalqları arasında inteqrasiya prosesinin inkişafında müstəsna xidmətlərinə və görə "31 Mart – Azərbaycanlıların Soyqırımı: Qanlı faciədən şanlı Zəfərə" mövzusunda elmi-praktik konfransda fəal iştirakına görə TAİB-nin İdarə Heyətinin üzvləri Mübariz Süleymanlı, Sara Göyçəli, Məcid Hacıyev və Akif Cabbarov "Fəxri diplom"la təltif edilib.

Məruzəçilər tərəfindən filialın kitabxanasına müxtəlif kitablar təqdim olunduqdan sonra xatirə şəkli çəkdirilib.

## "Məktəb liderliyi" proqramının II çağırışının yekunlarına dair görüş keçirilib






Aprelin 1-də "Məktəb liderliyi" proqramının (MLP) II çağırış üzrə iştirakçıları ilə proqramın yekununa dair görüş təşkil olunub.

Görüşdə layihə rəhbəri Könül Pirverdiyeva "Məktəb liderliyi" proqramının peşəkar inkişaf, yeni çağırışlara cavab verən məktəb lideri formalaşdırmaq, səmərəli öyrənmə mühiti yaratmaq kimi əsas hədəflərindən bəhs edib. Layihə rəhbəri proqram ərzində "Tədrisin təşkili və idarə edilməsi", "Təhsildə qiymətləndirmə və monitorinq", "Məktəb heyətinin idarə edilməsi", "Məktəb sənədləri ilə iş", "Məktəbdə səmərəli ünsiyyətin, sağlam psixoloji mühitin təşkili və idarə edilməsi" modullarının tədrisinin əhəmiyyətini vurğulayaraq, proses müddətində qazanılan bilik və bacarıqların iştirakçıların gələcək liderlik fəaliyyətlərinə töhfə verəcəyinə inamını ifadə edib.

Görüşdə proqram ərzində tədris olunan modullar üzrə nəzərdə tutulmuş yekun qiymətləndirmələr və təlimlərdə davamiyyət məsələləri barədə iştirakçılara ətraflı məlumat verilərək, yaranan suallar cavablandırılıb.

Qeyd edək ki, Azərbaycan Respublikasının Elm və Təhsil Nazirliyi və Azərbaycan Dövlət Pedaqoji Universitetinin Strateji İnkişaf Mərkəzi ilə birgə həyata keçirilən "Məktəb liderliyi" proqramı gələcəkdə dövlət ümumi təhsil müəssisələrində direktor vəzifəsində çalışmaq arzusunda olan pedaqoji kadrların səriştələrinin artırılmasını hədəfləyən təqaüd proqramıdır. MLP direktor, direktor müavini və müəllimlərin peşəkar inkişafları üçün öyrənmə və inkişaf mühiti yaradaq onların şəbəkələşməsinə, yeni çağırışlara cavab verən məktəb liderləri kimi formalaşmasına dəstək göstərən peşəkar inkişaf proqramıdır.

Məlumat üçün bildirək ki, Bakı, Sumqayıt şəhərləri və Abşeron rayonunu əhatə edən proqramın I çağırışından 49 nəfər məzun olmuşdur. Bakı, Sumqayıt şəhərləri və Abşeron rayonu ilə yanaşı digər regionları da əhatə edən MLP-nin II çağırışı üzrə isə hazırda 2 əyani qrupda 53 nəfər, 3 onlayn qrupda 73 nəfər olmaqla, ümumilikdə 126 nəfər proqramın iştirakçısıdır. Proqram ərzində modulların tədrisi Bakı, Sumqayıt və Abşerondan olan iştirakçılar üçün əyani, digər regionlardan olan iştirakçılar üçün isə hibrid formada təşkil olunub.

## Pedaqoji Universitetdə "Təhsildə ekoloji tərbiyə" mövzusunda tədbir keçirilib



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) SABAH mərkəzinin təşkilatçılığı ilə "Yaşıl dünya naminə həmrəylik ili"nə həsr olunmuş "Təhsildə ekoloji tərbiyə" mövzusunda tədbir keçirilib.

Tədbirin gedişində İBT201S qrupunun tələbələri ekologiyaya dair sərgi, təbiətə həsr olunmuş rəqs və şeirlər təqdim ediblər.

Daha sonra tədbirin qonağı olan ADPU SABAH məzunu, Hədəf STEAM liseyinin Abşeron filialının ibtidai sinif, təlim-tərbiyə və tədris işləri üzrə müdir müavini Mətanət Hüseynova çıxış edərək təhsildə ekoloji tərbiyənin təşkili və istifadə olunan metodlardan bəhs edib.

Eyni zamanda, dosent Elnurə Səfərova və Mətanət Hüseynova ilə birgə İBT201S qrup tələbələri ilə açıq dərs keçirilib. Dərs STEAM modeli ilə inteqrasiya edilib, "mTİNY" robotu ilə tələbələr robotlara düzgün kodlaşdırma tətbiq etmək və öz şəhərciklərini ekoloji qaydaya salmağı öyrəniblər.

Sonda tədbir iştirakçıları, müəllimlər və tələbələrlə birgə Universitetin həyətində çiçəklər əkilib.

## ADPU-nun Şəki filialının yeni direktoru fəal və əlaçı tələbələrlə görüşüb



Aprelin 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki filialının yeni direktoru, tarix üzrə fəlsəfə doktoru, dosent Vurğun Məmmədov filialın fəal və əlaçı tələbələri ilə geniş tərkibdə ilk görüşünü keçirib.

Görüşdə filialın direktor müavinləri, dekanlar, digər struktur bölmələr və tələbə təşkilatlarının rəhbərləri iştirak ediblər.

Direktor, dos. V. Məmmədov filialın gələcək fəaliyyət strategiyası barədə tələbələri məlumatlandırıb, görüləcək işlərdən bəhs edib.

Tədbirdə çıxış edən elmi işlər üzrə direktor müavini, dos. Nuralı Çələbiyev, tədris işləri üzrə direktor müavini vəzifəsini icra edən, tarix üzrə fəlsəfə doktoru, baş müəllim Vüsal Baxışov və Karyera Mərkəzinin müdiri, baş müəllim Xuraman Həmidova müzakirə olunan məsələlərlə bağlı öz fikirlərini bölüşüblər.

Sonra filialda keçirilmiş "Ən yaxşı Novruz xonçası" müsabiqəsində fərqlənən tələbə qruplarının nümayəndələrinə I, II, III dərəcəli diplomlar təqdim olunub.

Görüşün sonunda yeni direktor tələbələri dinləyib, onları maraqlandıran çoxsaylı sualları cavablandırıb, hər hansı problemlə qarşılaşan tələbələrin daim filial rəhbərliyinə müraciət edə biləcəyini diqqətə çatdırıb.

## Beynəlxalq şagird qiymətləndirmə tədqiqatlarının təşkilində iştirak edən ADPU-nun tələbə və məzunları mükafatlandırılıb



Aprelin 2-də Azərbaycan Respublikasının Elm və Təhsil Nazirliyi (AR ETN), Azərbaycan Respublikasının Təhsil İnstitutu (ARTİ) və Azərbaycan Dövlət Pedaqoji Universitetinin Strateji İnkişaf Mərkəzi (ADPU SİM) tərəfindən ölkəmizdə həyata keçirilən TIMSS 2023 və ICILS 2023 beynəlxalq şagird qiymətləndirmə tədqiqatlarının təşkilində iştirak edən ADPU tələbələri və məzunlarının müvafiq sertifikatlarla təltif olunma mərasimi keçirilib.

Qeyd edək ki, ötən il ADPU Strateji İnkişaf Mərkəzi tərəfindən TIMSS, ICILS, TALIS və IELS tədqiqatları üzrə işlər icra olunub.

TIMSS (Trends in Mathematics and Science Study) - riyaziyyat və elm üzrə beynəlxalq qiymətləndirmə tədqiqatı olub, IV və VIII sinif şagirdlərinin riyaziyyat və elm sahələri üzrə biliklərini qiymətləndirmək məqsədilə Təhsil Nailiyyətlərinin Qiymətləndirilməsi üçün Beynəlxalq Assosiasiya (IEA) tərəfindən hər 4 ildən bir təşkil olunur. Məlumat üçün bildirək ki, ADPU SİM tərəfindən TIMSS 2023 qiymətləndirməsindən öncə həyata keçirilən şagird təlimlərinə IV siniflər üzrə 4110 nəfər, VIII siniflər üzrə 5433 nəfər olmaqla, cəmi 9543 təhsilalan cəlb olunub. IV siniflərdə qiymətləndirmə 199 məktəbin 234 sinfində, VIII siniflərdə 196 məktəbin 260 sinfində kompüterəsaslı, 50 məktəbin 79 sinfində kağızəsaslı olmaqla təşkil olunub. Ümumilikdə 6961 nəfər IV sinif şagirdi, 6914 nəfər VIII sinif şagirdi kompüterəsaslı qiymətləndirmə tədqiqatında ölkəmizi təmsil edib.

Bununla yanaşı, ADPU SİM-in təşkilatçılığı ilə peşəkar qiymətləndirmə mütəxəssislərinin dəstəyi, Universitetin tələbə və məzunlarının iştirakı ilə 2023-cü ilin iyul-avqust aylarında baş tutan TIMSS 2023 tədqiqatının açıq suallarının yoxlanılması (scoring) prosesində 59.675 ədəd IV sinif, 66.284 ədəd VIII sinif şagirdlərinin cavabları qiymətləndirilib. TIMSS 2023 valideyn sorğularının (Early Learning Survey) elektron bazaya daxil edilməsi (punching) prosesində isə IV siniflərdə 6621 ədəd, VIII siniflərdə 1880 ədəd kağızəsaslı sorğu elektronlaşdırılıb, 2012 ədəd nailiyyət testi beynəlxalq sistemə daxil edilib.

Həmçinin VIII sinif şagirdlərinin kompüter və informasiya savadlılığı üzrə beynəlxalq qiymətləndirmə tədqiqatı olan ICILS (International Computer and Information Literacy Study) tədqiqatında Bakı, Sumqayıt şəhərləri, Abşeron rayonu və digər regionlarda şagird və müəllim təlimləri, regionlarda qiymətləndirmənin təşkili, açıq sualların yoxlanılması prosesləri də ADPU SİM tərəfindən icra olunub. Yalnız VIII siniflərin iştirakı ilə kompüterəsaslı ICILS qiymətləndirməsində, ümumilikdə 32.936 açıq sualın yoxlanışı həyata keçirilib.

## "Yaşıl dünya naminə həmrəylik ili" çərçivəsində tədbirlər davam etdirilir



"Yaşıl dünya naminə həmrəylik ili" çərçivəsində Azərbaycan Dövlət Pedaqoji Universitetinin Gənc Məzunlar Assosiasiyasının (ADPU GMA) təşkilatçılığı, "Təmiz Şəhər" ASC-nin dəstəyi ilə Bakı şəhəri M.Rahim adına 7 nömrəli tam orta məktəbdə bərk məişət tullantılarının düzgün idarə edilməsi ilə bağlı maarifləndirici təlim keçirilib.

Görüşdə məktəbin direktoru Könül Təhməzova, ADPU GMA-nın rəhbəri Eltac Cəbiyev, Universitetin Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli iştirak ediblər.

Ətraf mühitin mühafizəsi sahəsində maarifləndirmə işinə xidmət edən təlimdə hər bir Yer sakininin üzərinə düşən öhdəlik və təbiətə biganə münasibətin nəticəsində baş verən dəyişikliklər haqqında danışan "Təmiz Şəhər" ASC-nin mətbuat katibi Orxan Cabbarlı mövzu haqqında ətraflı məlumat verib.

Şagirdlərlə görüşdə tullantıların çeşidlənərək toplanmasının əhəmiyyəti vurğulanıb, onları maraqlandıran suallar ətrafında fikir mübadiləsi aparılıb və bərk məişət tullantılarının düzgün idarə edilməsi ilə bağlı maarifləndirici bukletlər paylanılıb.

Həmçinin "Yaşıl dünya naminə həmrəylik ili" ilə bağlı həyata keçirilən tədbirlər çərçivəsində ADPU-nun tədris binalarında müxtəlif növ tullantılar üçün nəzərdə tutulan böyük tullantı konteynerlərindən əlavə, IDEA İctimai Birliyi və "Azersun Holding" MMC-nin birgə layihəsi əsasında hazırlanmış kağız tullantıların toplanması üçün karton qutular yerləşdirilib.

## ADPU-da tələbələrin bədii yaradıcılıq festivalının baxış mərhələsi keçirilib



Aprelin 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) tələbələrin bədii yaradıcılıq festivalının baxış mərhələsi keçirilib.

ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, Azərbaycan Respublikasının Əməkdar incəsənət xadimi, yekun konsertin quruluşçu rejissoru Hafiz Quliyev, Əməkdar incəsənət xadimi, şair Baba Vəziroğlu , Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin şöbə müdiri Rüstəm Nəzirov, ADPU Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev, ADPU Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri v.m.i.e. Camilə Qurbanova, Bakı Xoreoqrafiya Akademiyasının müəllimi Nigar Şahmuradova və tarzən Aslan Növsəli tələbələrin çıxışlarını dinləyiblər.

Festivalın baxış mərhələsində ADPU tələbələrinin ifasında rəngarəng şeir, musiqi və rəqs nömrələri təqdim olunub.

Məlumat üçün bildirək ki, festival qaliblərinin yekun konsertinin may ayının birinci ongünlüyündə keçirilməsi nəzərdə tutulur. Qeyd edək ki, qaliblər Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi və Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Komitəsinin diplom və mükafatları ilə təltif ediləcəklər.

# ADPU-da "Təhsildə menecment və yeni təlim texnologiyaları" Magistrantların VII Respublika elmi konfransı keçirilib



Aprelin 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Təhsildə menecment və yeni təlim texnologiyaları" Magistrantların VII Respublika elmi konfransı öz işinə başlayıb.

27 mart – Elm Gününə həsr olunan konfransın plenar iclasında giriş sözü ilə çıxış edən ADPU-nun rektoru, konfransın Təşkilat Komitəsinin sədri, professor Cəfər Cəfərov diqqətə çatdırıb ki, Azərbaycan müstəqillik əldə etdikdən sonra, xüsusən, böyük Zəfərdən sonra ölkədə elmin və təhsilin inkişafı sahəsində böyük işlər görülür. Vurğulanıb ki, işğaldan azad edilmiş ərazilərdə – Qarabağ və Şərqi Zəngəzurda "Böyük Qayıdış"la bağlı xeyli sayda infrastruktur layihələri həyata keçirilir, təhsil ocaqları inşa olunur. Azərbaycan Respublikasının Prezidenti Cənab İlham Əliyevin 28 noyabr 2023-cü il tarixli Sərəncamı ilə Xankəndi şəhərində Qarabağ Universiteti yaradılmışdır.

Rektor qeyd edib ki, son illərdə aparılan islahatlar, həyata keçirilən yeniliklər, layihələr universitetin yeni inkişaf mərhələsinə daxil olmasına şərait yaradıb.

Bildirilib ki, biz əldə edilmiş uğurlarla kifayətlənməməli, fəaliyyətimizi müasir dünyanın çağırışlarına uyğun qurmalıyıq. Bu baxımdan magistrantların da üzərinə böyük məsuliyyət düşür.

Çıxış edən ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, konfransın Təşkilat Komitəsinin sədr müavini, professor Asəf Zamanov qeyd edib ki, bütün fəaliyyəti xalqa xidmət nümunəsi olan Ümummilli Lider Heydər Əliyevin elm strategiyası milli quruculuq siyasətinin əsas istiqamətlərindən biri olub və hazırda da uğurla davam edir. Ulu Öndər siyasi kursunun layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin ölkəmizdə Elm Gününün təsis edilməsi haqqında Sərəncamı cəmiyyətin inkişafında elmin vacibliyinin dərk olunması və xüsusilə gənclər arasında təbliği baxımından mühüm əhəmiyyətə malikdir. Ölkədə elm və təhsilin inteqrasiyası istiqamətində son illərdə aparılan islahatlar elm və təhsilin inkişafında yeni mərhələnin başlanğıcı, bu vacib sahəyə yüksək diqqətin göstəricisi hesab oluna bilər.

Professor Asəf Zamanov diqqətə çatdırıb ki, universitetdə magistratura və doktorantura səviyyəsində dövrün tələblərinə uyğun yeni nəsil mütəxəssislər hazırlanması işini təkmilləşdirmək məqsədilə ardıcıl tədbirlər həyata keçirilir. Son dövrlərdə universitetdə ali təhsilin bütün sahələri üzrə mütəxəssis hazırlığında əsaslı irəliləyiş müşahidə olunur, beynəlxalq təcrübə öyrənilir, dövrün tələblərinə uyğun yeni ixtisaslar yaradılır, mövcud ixtisaslaşmaların məzmununun yenilənməsi istiqamətində iş aparılır. Hazırda Pedaqoji Universitetdə 22 ixtisas üzrə 29 ixtisaslaşmada magistr hazırlığı həyata keçirilir.

Xüsusilə vurğulanıb ki, magistratura səviyyəsində ənənəvi ixtisaslaşmalardan başqa son illərdə universitetdə yeni ixtisaslaşmalara qəbul aparılır. Onlardan Menecment (təhsilin təşkili və idarə olunması) ixtisaslaşması üzrə ABŞ-nin Corc Vaşinqton Universiteti ilə həyata keçirilən ikili diplom proqramı, Menecment (ali təhsilin təşkili və idarə edilməsi) ixtisaslaşması, MBA proqramı üzrə "Təhsilin təşkili və idarə olunması" və "Təhsil üzrə marketinq fəaliyyəti" ixtisaslaşmaları, eləcə də SABAH proqramı üzrə "Təlim və tədrisin təşkili və metodikası" ixtisaslaşmasını göstərmək olar.

Prorektor bildirib ki, təhsilin keyfiyyəti anlayışının sürətlə dəyişdiyi dövrümüzdə yeni təfəkkür tərzinə malik mütəxəssislərin yetişdirilməsində ali təhsil müəssisələrinin gənc tədqiqatçıları və gənc müəllimlərin üzərinə böyük məsuliyyət düşür. Bu cür konfranslarda dövrün, təhsilin, tədrisin ən son problemləri müzakirəyə çıxarılmalı, magistrlik dissertasiya mövzularında ən aktual məsələlər elmi müzakirəyə cəlb olunmalıdır.

ADPU-nun Magistratura və doktorantura şöbəsinin müdiri, konfransın məsul katibi, s.e.ü.f.d. Rəşad Sadıqov diqqətə çatdırıb ki, konfransda ADPU ilə yanaşı Bakı Slavyan Universiteti, Mingəçevir Dövlət Universiteti, Azərbaycan Universiteti, Bakı Qızlar Universitetinin magistrantları, eləcə də Hökumətlərarası Təqaüd Proqramı çərçivəsində universitetdə təhsil alan Çin vətəndaşı olan magistrantlar da iştirak edirlər.

Daha sonra ADPU-nun İbtidai təhsilin pedaqogikası kafedrasının müdiri, professor Fərrux Rüstəmov, Məktəbəqədər təhsilin pedaqogikası kafedrasının müdiri, professor Müseyib İlyasov, Analitik və üzvü kimya kafedrasının müdiri v.i.e., professor Əli Zalov çıxış edərək öz təəssüratlarını bölüşüblər.

Plenar iclasda ADPU-nun magistrantı Pərvanə Bayramova "Təhsilin müxtəlif sahələrində süni intellektdən istifadə", BSU-nun magistrantı Həqiqət Hüseynzadə "Latın dilinin istifadə olunması və əhəmiyyəti", MDU-nun magistrantı Samirə Abbasova "Şifahi xalq ədəbiyyatı örnəkləri: atalar sözlərinin tədrisi mədəni irsi qorumağın bir nümunəsidir" mövzularında məruzə ediblər.

Plenar iclas başa çatdıqdan sonra Təhsildə strateji idarəetmə, İnnovasiyalar və təhsilin keyfiyyəti, Təhsildə sosial-psixoloji xidmət, Tədrisin müasir problemləri-1 və Tədrisin müasir problemləri-2 bölmələri üzrə konfrans işini davam etdirib.

Qeyd edək ki, iki gün davam edən konfransda 306 məruzə dinlənilib, müzakirələr aparılıb. Təşkilat Komitəsinin yekun rəyinə əsasən çapa tövsiyə olunan elmi məruzələr topluya daxil ediləcək və konfrans materiallarında nəşr olunacaq.

## ADPU-nun Quba filialında Aprel döyüşlərinə həsr olunmuş tədbir: Qələbənin ilk addımları



Aprelin 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialının və Gənclərin İnkişaf və Karyera Mərkəzinin (GİKM) Quba-Xaçmaz Regional Nümayəndəliyinin təşkilatçılığı ilə Aprel döyüşlərinin səkkinci ildönümünə həsr edilmiş "Qələbənin ilk addımları" adlı tədbir keçirilib. Əvvəlcə, şəhidlərimizin xatirəsi bir dəqiqəlik sükut ilə yad edilib. Filialın Heydər Əliyev lektoriyasının müdiri Nəhayət Şirinovanın moderatorluğu ilə keçirilən tədbirdə filialın direktoru, dosent Yusif Alıyev məruzə ilə çıxış edərək, Vətən müharibəsində qələbə qazanılmasında Aprel döyüşlərinin rolunu xüsusilə qeyd edib.

Direktor, gəncləri daha da vətənpərvər olmağa, Zəfər tariximizin səhifələrini mükəmməl mənimsəməyə çağırıb. Tədbirdə iştirak edən 44 günlük Vətən müharibəsi veteranları Tarıyel Ağasıyev, Orxan Babayev və İlkin Abayev də gənclərlə öz döyüş xatirələrini bölüşüb, tələbələrin suallarını cavablandırıblar.

Tədbirin sonunda Aprel döyüşlərinə həsr edilmiş sənədli film nümayiş olunub.

## ADPU-nun əməkdaşları Erasmus+ proqramı çərçivəsində Danimarkada beynəlxalq həftədə iştirak edib





Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Xarici Dillər Mərkəzinin müəllimi Gülhəyat Abdullayeva, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi Gülnar Ələkbərova, Tarix və coğrafiya fakültəsinin Azərbaycan coğrafiyası və coğrafiyanın tədrisi texnologiyası kafedrasının müəllimi Leyla Əliyeva və Fəlsəfə və sosial elmlər kafedrasının müəllimi Lalə Quliyeva Erasmus+ mübadilə proqramı çərçivəsində 08-12 aprel tarixlərində Danimarkanın Kopenhagen Universitet Kollecində (UCC) təşkil olunan beynəlxalq həftədə iştirak ediblər. "Potensialları və çətinlikləri tarazlayan – Rəqəmsal Həyat" mövzusuna həsr olunmuş beynəlxalq həftədə müxtəlif ölkələrdən 100-dən çox akademik heyət üzvü iştirak edib. "Rəqəmsal bacarığı təhsilə necə inteqrasiya etmək olar?", "Texnologiya ilə bütünləşmiş müasir dünyada təhsildə rəqəmsal savadlılığı və bacarıqları necə inkişaf etdiririk", "Rəqəmsal alətlər və bacarıqlar", "Məktəblərdə rəqəmsallaşdırma", "Beynəlxalq əməkdaşlığın və biliyin texnologiyalar vasitəsilə gücləndirilməsi", "Virtual əməkdaşlığın və tələbə mübadiləsinin asanlaşdırılması" və s. mövzularda təqdim edilən mühazirə, qrup işləri və müzakirələr (debatlar) böyük maraqla qarşılanıb. Beynəlxalq həftə çərçivəsində Pedaqoji Universitetin beynəlxalq əlaqələr üzrə mütəxəssisi Gülnar Ələkbərova və Xarici Dillər Mərkəzinin müəllimi Gülhəyat Abdullayeva "Beynəlxalq əməkdaşlığın və biliyin texnologiyalar vasitəsilə gücləndirilməsi" və "Virtual əməkdaşlığın və tələbə mübadiləsinin asanlaşdırılması" mövzularında keçirilən təlimlərdə iştirak edib, müxtəlif ölkələrdən olan universitetlərlə qarşılıqlı əməkdaşlıq məsələlərini müzakirə ediblər. Tarix və coğrafiya fakültəsinin Azərbaycan coğrafiyası və coğrafiyanın tədrisi texnologiyası kafedrasının müəllimi Leyla Əliyeva və Fəlsəfə və sosial elmlər kafedrasının müəllimi Lalə Quliyeva coğrafiya fənni üzrə dərs müşahidələri aparmış, dərsin quruluşu, istifadə olunan tapşırıqlar, tələbələrin hazırladıqları əyani vəsaitlərlə tanış olmuşlar. Ditte Marie Pagaard ilə "Dayanıqlı inkişaf və urbanizasiya" mövzusunda çöl təcrübəsində iştirak edən müəllimlər, həmçinin Peter Mikael Hansenin "Tektonik tavaların hərəkətliyiyi" mövzusunda dərsində iştirak ediblər. "Dayanıqlı inkişaf və urbanizasiya", "Coğrafiyaya kurrikulumun tətbiqi", "Coğrafiya dərslərində çöl təcrübəsinin təşkili" kimi mövzularda UCC və ADPU coğrafiyaçıları arasında təcrübələrin öyrənilməsi və tətbiq olunması məsələləri müzakirə olunub.

Həmçinin, səfər zamanı ADPU nümayəndələri ilə Erasmus+ mübadilə proqramı çərçivəsində Kopenhagen Universitet Kollecində təhsil alan Pedaqoji Universitet tələbələri arasında görüş keçirilib.

## ADPU-nun prorektoru və əməkdaşları məktəbəqədər təhsil müəssisələrinin rəhbərləri üçün adaptasiya təlimində təqdimatla çıxış ediblər



Məktəbəqədər və Ümumi Təhsil üzrə Dövlət Agentliyinin (MÜTDA) yeni təyinat alan məktəbəqədər təhsil müəssisələrinin rəhbərləri üçün təşkil etdiyi adaptasiya təlimində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva və ADPU-nun Strateji İnkişaf Mərkəzinin (ADPU SİM) əməkdaşları təqdimatla çıxış ediblər.

Təlimdə ADPU-nun strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva "Məktəbəqədər təhsil müəssisələrinin öyrənən təşkilat kimi pedaqoji və sosial təsirləri" mövzusunda təqdimatla çıxış edib. K.Pirverdiyeva Peter M. Sengenin "Beşinci disiplin" kitabında öyrənən təşkilatların əsas modelləri olaraq qeyd edilən paylaşılan vizion, mental modellər, şəxsi ustalıq, komanda olaraq öyrənmənin bu tip təşkilatların formalaşmasında əhəmiyyətini vurğulayıb. O, öyrənən təşkilatların hər zaman digər təşkilatlarla müqayisədə bir addım öndə olduğunu ifadə edib. Bu prosesin çatılacaq bir hədəf deyil, uzun bir yol olduğunu qeyd edən prorektor yeni təyinat alan müəssisə rəhbərlərinə bu yolda uğurlar arzulayıb.

Mərkəz əməkdaşları tərəfindən erkən öyrənmənin uşaqların inkişafındakı rolu, məktəbəqədər təhsilin şagirdlərin akademik nailiyyətlərinə, gələcək karyera inkişafına təsiri barədə məlumat verilərək, IELS beynəlxalq tədqiqatında erkən öyrənmənin əhəmiyyətinə dair çağırışlar müəssisə rəhbərlərinin diqqətinə çatdırılıb. Bunlarla yanaşı, ölkəmizin iştirak etdiyi beynəlxalq tədqiqatlar (TIMSS, ICILS, PISA, TALIS, PIRLS) haqqında qısa məlumat verilib.

Qeyd edək ki, 2024-cü ildə pilot mərhələsi təşkil olunan, 2025-ci ildə əsas mərhələsinin keçirilməsi planlaşdırılan IELS tədqiqatında 5 yaşlıların ilkin savadlılıq və hesablama, özünütənzimləmə və sosial-emosional bacarıqları ölçülür. Ölkəmiz bu tədqiqatda ilk dəfə iştirak edir.

## ADPU-nun Şəki filialında Aprel döyüşlərinə həsr olunmuş elmi seminar keçirilib



Aprelin 8-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki filialının Humanitar fənlər kafedrası və Azərbaycan Respublikasının Dini Qurumlarla iş üzrə Dövlət Komitəsinin (DQİDK) Şəki bölgəsi üzrə şöbəsinin birgə təşkilatçılığı ilə "4 günlük müharibə – Aprel döyüşləri Vətən müharibəsindəki zəfərimizin başlanğıcı kimi" mövzusunda elmi seminar keçirilib. Əvvəlcə, vətən uğrunda şəhid olanların xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Filialın tədris işləri üzrə direktor müavini vəzifəsini icra edən, t.ü.f.d. Vüsal Baxışov giriş sözü ilə çıxış edərək xalqımızın ötən əsrin 80-ci illərinin sonlarından başladığı milli mübarizəsinin sonda dövlət müstəqilliyinin bərpası ilə nəticələndiyini xüsusi vurğulayaraq, bunun xalqımızın əldə etdiyi ən böyük tarixi nailiyyətlərdən biri olduğunu qeyd edib. Daha sonra 2016-cı ilin Aprel döyüşləri və onun tarixi əhəmiyyəti barədə fikirlərini bölüşərən V. Baxışov qeyd edib ki, məhz bu 4 günlük müharibə Vətən torpaqlarının azad olunması uğrunda mübarizəmizin başlanğıcı hesab oluna bilər. Məhz bu zəmin üzərində Müzəffər Ali Baş Komandanla həmrəy olan xalqımız 2020-ci ildə tarixi Zəfər qazanmış və bu gün ölkəmizin suveren hüquqları bütün Azərbaycan Respublikası ərazisində bərqərar olmuşdur.

Daha sonra DQİDK-nın Şəki bölgəsi üzrə şöbəsinin məsləhətçisi Minarə Məmmədhüseynova "Aprel döyüşləri - Böyük zəfərin başlanğıcıdır" mövzusunda məruzə edib. O, məruzəsində Aprel döyüşlərindəki qələbənin Azərbaycanın beynəlxalq nüfuzuna təsirindən danışıb.

Məruzə edən ADPU-nun Şəki filialının Humanitar fənlər kafedrasının baş müəllimi Tahir Məhərrəmov Ermənistan-Azərbaycan münaqişəsinin mahiyyəti barədə geniş məlumat verib. Ümummilli Lider Heydər Əliyev və Müzəffər Ali Baş Komandan, Prezident İlham Əliyevin ordu quruculuğu sahəsində həyata keçirdiyi ölçüyəgəlməz islahatlar barədə söhbət açaraq, bu tarixi fəaliyyətin əməli nəticəsinin Aprel döyüşləri və bu döyüşlərdəki qələbədə təzahür etdiyini qeyd edib. Məruzəçi Aprel döyüşlərinin vətən torpaqlarının işğaldan azad olunması uğrunda mübarizənin əsas tarixi dönüş anlarından biri olduğunu vurğulayıb.

Çıxışlardan sonra seminar qarşılıqlı müzakirə formatında davam etdirilib.

## Pedaqoji Universitetdə Fizika Günü qeyd olunub






Aprelin 9-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Fizika fakültəsinin təşkilatçılığı ilə 12 Aprel – Fizika Günü münasibətilə tədbir keçirilib.

Universitetin böyük akt zalında keçirilən tədbirdə ADPU rəhbərliyi, fakültə dekanları, professor-müəllim heyəti və tələbələr iştirak ediblər.

Tədbirdən əvvəl universitetin foyesində Fizika Gününə həsr olunmuş sərgiyə baxış keçirilib. Sərgidə fizika müəllimliyi və texnologiya müəllimliyi ixtisaslarında təhsil alan tələbələrin, eləcə də "Hədəf" liseyinin şagirdlərinin hazırladıqları cihazlar, robotlar, müxtəlif materiallardan dizayn edilmiş modellər nümayiş etdirilib.

Vətənimizin azadlığı uğrunda canlarından keçən şəhidlərimizin əziz xatirələrinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlayan bədii hissədə tələbələrin hazırladıqları bir-birindən maraqlı səhnəciklər, rəqslər və ifalar iştirakçılara xoş təsir bağışlayıb. Tədbir fakültə himninin ifası ilə yekunlaşıb.

## Professor Sərvət Özdəmir ADPU-nun Quba filialında olub



Pedaqoji Universitetin strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva və Türkiyənin Başkənd Universitetinin Təhsil fakültəsinin müəllimi, Təhsil Elmləri İnstitutunun müdiri, professor Sərvət Özdəmir ADPU-nun Quba filialında olublar. Qonaqları filialla tanış edən direktor, dosent Yusif Alıyev, əvvəlcə, son illər yaradılan yeni tipli auditoriyalar, kabinetlər, mərkəzlər, filialda aparılan yenidənqurma və bərpa işləri haqqında ətraflı məlumat verib, qarşıdakı hədəflər haqqında danışıb, təcrübə mübadiləsi imkanları müzakirə olunub. Daha sonra filial kollektivi görüş keçirilib, "Təhsil və idarəetmə" mövzusunda fikir mübadiləsi aparılıb, suallar cavablandırılıb. Sonda xatirə şəkli çəkdirilib və Quba Soyqırımı Memorial Kompleksi ziyarət edilib.

## Türkiyənin Hacettepe Universitetinin professoru ADPU-nun qonağı olub



Aprelin 15-də Türkiyənin Hacettepe Universitetinin təhsil elmləri üzrə professoru Səlahəddin Gelbal Azərbaycan Dövlət Pedaqoji Universitetini (ADPU) ziyarət edib.

Qonaq ADPU-nun rektoru, professor Cəfər Cəfərov və beynəlxalq əlaqələr üzrə prorektor, professor Mahirə Hüseynova ilə görüşüb. Görüşdə, həmçinin elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov, tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, strateji inkişaf məsələləri üzrə prorektor Könül Pirverdiyeva, Elm və Ali Təhsil üzrə Dövlət Agentliyinin ali təhsil müəssisələri ilə iş sektorunun müdiri Elza Səmədova və ADPU-nun Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi Rufanə Əhmədova iştirak ediblər.

Görüş zamanı, rektor, professor Cəfər Cəfərov ADPU haqqında ətraflı məlumat verib, ADPU və Türkiyə universitetləri arasında mövcud əlaqələrdən danışılıb, elmi əlaqələrin qurulması, akademik heyətin, tələbələrin qarşılıqlı mübadiləsi perspektivləri müzakirə olunub. Görüşdə, həmçinin təhsildə qiymətləndirmə və monitorinqin əhəmiyyəti vurğulanıb və bu sahədə əməkdaşlıq və təcrübə mübadiləsi ilə bağlı ətraflı müzakirələr aparılıb.

Həmçinin, SABAH qruplarının təşkilatçılığı ilə Hacettepe Universitetinin professoru Selahaddin Gelbal Pedaqoji Universitetdə ADPU, ADA, ADMİU və Xəzər Universitetinin müvafiq ixtisaslarda təhsil alan 80 nəfərdən çox magistrantı üçün "Təhsildə ölçmə, qiymətləndirmə və elmi tədqiqatda data analizi" mövzusunda modul dərsin tədrisinə başlayıb.

# Pedaqoji Universitetin Tələbə Həmkarlar İttifaqı Komitəsinə yeni sədr seçilib

Aprelin 15-də Azərbaycan Dövlət Pedaqoji Universiteti Tələbə Həmkarlar İttifaqı Komitəsinin (ADPU THİK) XVIII hesabat-seçki konfransı keçirilib.

Konfransda ADPU-nun Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev, ADPU THİK-nın keçmiş sədri, dosent Vurğun Məmmədov və ittifaqın üzvü olan tələbələr iştirak ediblər. Sədr səlahiyyətlərini müvəqqəti icra edən Cəmilə Qurbanova konfransı açıq elan edərək iştirakçıları salamlayıb və konfransda ötən 7 illik dövrdə təşkilatın fəaliyyəti ilə bağlı hesabatın dinləniləcəyini, eyni zamanda yeni idarə heyətinin seçiləcəyini diqqətə çatdırıb . Çıxış edən ADPU HİK sədri, dosent Vaqif Əliyev konfransın işinə uğur diləyib.

Daha sonra gündəliyə uyğun olaraq ADPU Tələbə Həmkarlar İttifaqı Komitəsinə 2003-2024-cü illərdə sədrlik etmiş dos. Vurğun Məmmədov təşkilatın 2017-2024-cü illərdə görülmüş işlər haqqında hesabatını təqdim edib. Hesabat ətrafında çıxış edənlərdən Təftiş Komissiyasının sədri Lamiyə Əlicanova, İnsan resursları departamentinin sədri İlahə Vəliyeva və Filologiya fakültəsi üzrə komitənin sədri Aytac Muradlı Tələbə Həmkarlar İttifaqı Komitəsinin son 7 ildə gördüyü işlər və icra olunan sosial-mədəni fəaliyyətləri müsbət qiymətləndiriblər. Ümumilikdə, konfrans iştirakçıları hesabat dövründə təşkilatın işini qənaətbəxş hesab ediblər.

Daha sonra Pedaqoji Universitetin Tələbə Həmkarlar İttifaqı Komitəsinin İdarə Heyətinə seçkilər keçirilib. Əvvəlcə, İdarə Heyətinə namizədlər irəli sürülüb və açıq səsvermə yolu ilə yeni tərkib seçilib.



Yeni tərkibin seçilməsindən sonra ADPU HİK sədri, dos. Vaqif Əliyev 2022-2024-cü illərdə Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədr müavini olmuş Cəmilə Qurbanovanın sədrliyə namizədliyini elan edib.

Açıq səsvermə əsasında Cəmilə Qurbanova mütləq səs çoxluğu ilə Pedaqoji Universitetin Tələbə Həmkarlar İttifaqı Komitəsinin yeni sədri seçilib.

Çıxış edən ADPU THİK-nın yeni sədri C.Qurbanova göstərilən etimada görə kollektivə öz minnətdarlığını bildirib və tələbələrin rifahının daha da yaxşılaşdırılması istiqamətində əzmlə çalışacağına söz verib.

Sonda dos. V.Əliyev Universitet rəhbərliyinin Tələbə Həmkarlar İttifaqı Komitəsinə daim diqqət və qayğı ilə yanaşdığını, təşkilatın yeni İdarə Heyəti ilə bundan sonra da uğurla fəaliyyət göstərəcəyinə əminliyini ifadə edib.

# ADPU-da "Yaşıl təhsil" elmi-praktik konfransı keçirilib



Aprelin 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Ekoloji Bilik Gününə həsr olunmuş "Yaşıl təhsil" elmi-praktik konfransı keçirilib.

Konfransda ADPU-nun rəhbərliyi, professor-müəllim heyəti, həmçinin Milli Məclisin Təbii ehtiyatlar, energetika və ekologiya komitəsinin sədri, dosent Sadiq Qurbanov, Ekologiya və Təbii Sərvətlər Nazirliyi yanında Milli Hidrometeorologiya Xidmətinin Beynəlxalq əməkdaşlıq və ictimaiyyətlə əlaqələr sektorunun müdiri, dosent Fuad Hümbətov, eləcə də tələbələr iştirak ediblər.

Konfransı giriş sözü ilə açan Universitetin rektoru, professor Cəfər Cəfərov konfransın təşkil edilməsinin əsas məqsədinin cəmiyyətdə ekoloji biliklər və ekoloji mədəniyyətin formalaşması və ekoloji təhsilin əhəmiyyətini təbliğ edərək önə çəkmək olduğunu diqqətə çatdırıb. Rektor, eyni zamanda bu il ölkəmizin ev sahibliyi edəcəyi COP29 - BMT-nin İqlim Dəyişikliyi üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyasının Azərbaycanda keçirilməsinin əhəmiyyətini vurğulayıb.

Milli Məclisin komitə sərdi, dosent Sadiq Qurbanov "Yaşıl dünya: problemlər, prespektivlər" mövzusunda məruzə ilə çıxış edərək ekologiya problemləri, o cümlədən iqlim dəyişikliyi, təbii ehtiyatların tükənməsi, biomüxtəlifliyin azalması, qida çatışmazlığı və ətraf mühitin çirklənməsinin mühüm sosial-iqtisadi problemlərdən olduğunu diqqətə çatdırıb. Vurğulanıb ki, biosferin tarazlığını təmin etmək üçün daim artan ehtiyaclarımızı planetin təbii imkanlarına uyğunlaşdırmaq zərurətinin dərk edilməsi hazırda dünya birliyi səviyyəsində qəbul edilən dayanıqlı inkişaf paradiqmasının formalaşmasına gətirib çıxarıb. Təhsil və mədəniyyət sahəsində ekoloji məsələlərin prioritetini müəyyən edən müasir innovativ inkişafın, siyasətin, iqtisadiyyatın və hüququn əsasında məhz ekoloji tələblərin dayandığı bildirilib.

ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov "Ekoloji maarifləndirmə prioritetlərdən biri kimi" mövzusunda məruzəsində bildirib ki, ekoloji biliklərin daim yenilənməsi müasir dövrün mühüm tələblərindəndir. Ekoloji təhsil həm də gələcək mütəxəssislərin ekoloji tərbiyəsinin mühüm tərkib hissəsidir.

Professor A.Zamanov Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 25 dekabr 2023-cü il tarixli Sərəncamı ilə 2024-cü ilin ölkəmizdə "Yaşıl dünya naminə həmrəylik ili" elan edilməsinin əhəmiyyətini, Azərbaycanın 2030-cu ilə qədər beş milli prioritetindən birinin "Təmiz ətraf mühit və yaşıl artım ölkəsi" müəyyən edilməsi ilə əlaqədar insanların ekoloji maarifləndirilməsinin vacibliyini xüsusi vurğulayıb.

Konfransda "Ətraf mühit və qanunvericilik" mövzusunda məruzə edən dosent Fuad Hümbətov təbiətdən istifadənin, ətraf mühitin mühafizəsinin və ekoloji təhlükəsizliyin təmin edilməsinin əsas prinsiplərindən söz açıb, qanunvericilik məsələlərinin prioritetliyindən bəhs edib. Azərbaycan Respublikası Prezidentinin fərman və sərəncamları, Azərbaycan Respublikası Nazirlər Kabinetinin qərarları və qanunların ölkədə ekologiya sahəsində ictimai münasibətlərin lazımi səviyyədə tənzimlənməsini təmin etdiyi konfrans iştirakçılarının diqqətinə çatdırılıb.

Sonda ADPU-nun Biologiya və onun tədrisi texnologiyası kafedrasının dosenti Şəbnəm Əsədova "Hər kəs üçün yaşıl dünya" adlı məruzəsində Azərbaycanın müasir ekoloji problemləri, bu problemlərin dayanıqlı həlli yolları, ekoloji tarazlığın qorunması, ekoloji təhsilin fasiləsizliyi və digər məsələlər haqqında məlumat verib.

# ADPU-da "Qərbi Azərbaycanın siyasi tarixi və etnik mənzərəsi" mövzusunda mühazirə təşkil olunub



Aprelin 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Qərbi Azərbaycan Araşdırmalar Mərkəzinin təşəbbüsü ilə Tarix və coğrafiya fakültəsində Azərbaycan tarixi kafedrasının dosenti, tarix üzrə fəlsəfə doktoru Zakir Kərimovun "Qərbi Azərbaycanın siyasi tarixi və etnik mənzərəsi" mövzusunda mühazirəsi təşkil olunub. Mühazirədə Azərbaycan tarixi, Ümumi tarix və tarixin tədrisi texnologiyası kafedralarının professor-müəllim heyəti, tarix müəllimliyi ixtisasının 2101B və 2102B qrupunun tələbələri iştirak ediblər.

Tədbiri giriş sözü ilə açan Azərbaycan tarixi kafedrasının müdiri, dosent Naibə Əhmədova mövzunun aktuallığından, indiki Ermənistan adlanan ərazidə mərhələ-mərhələ Azərbaycan torpaqlarından qoparılaraq qondarma Ermənistan Respublikasının yaradılmasından, Azərbaycan türklərinin bu ərazidəki izlərinin tarixdən silinməsi üçün məqsədli addımlar atılmasından danışıb.

Zakir Kərimov mühazirədə erkən orta əsrlər dövründən başlayaraq bu günədək Qərbi Azərbaycan ərazisinin tarixi-siyasi coğrafiyasından, əhalisindən və sərhədlərindən bəhs edib. Mühazirəçi qeyd edib ki, Ermənistan təkcə Azərbaycanın torpaqlarına deyil, eyni zamanda onun tarixinə, toponimlərinə təcavüz edib.

Müzakirələrlə davam edən tədbirdə iştirakçılar ermənilər tərəfindən yayılan saxta informasiyalara cavab verilməsi üçün bu cür mühazirələrin silsilə şəklində keçirilməsinin vacibliyi və əhəmiyyətini vurğulayıblar.

# ADPU-nun əməkdaşları Niderland Krallığında səfərdə olublar



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova, Keyfiyyətin təminatı şöbəsinin müdiri Qalib Şərifov və Beynəlxalq layihələr və qrantlar şöbəsinin baş mütəxəssisi Gülnar Dəmirova Erasmus+ proqramı çərçivəsində icra olunan, Avropa Komissiyasının (AK) maliyyələşdirdiyi "Azərbaycan və Rusiya ali təhsil müəssisələrində təlim, tədris və qiymətləndirmə prosesinin daxili keyfiyyət təminatının təkmilləşdirilməsi" (IQAinAR) layihəsinin Niderlandda keçirilən növbəti təlimlərinə qatılıblar. Niderland Krallığının Wittenborg Tətbiqi Elmlər Universitetinin koordinatoru olduğu layihənin əsas məqsədi ali təhsil müəssisələrində daxili keyfiyyət təminatının və eləcə də təhsildə təlim-tədris və qiymətləndirmə proseslərinin təkmilləşdirilməsindən ibarətdir. Görüşdə layihənin yerli tərəfdaşları olaraq Pedaqoji Universitet və Naxçıvan Dövlət Universiteti, xarici tərəfdaşları olaraq İspaniyanın Mursiya Katolik Universiteti, Niderland Krallığının 456 International B.V təşkilatı və Wittenborg Tətbiqi Elmlər Universitetindən olan nümayəndələr iştirak ediblər.

Təlimlər 15-19 aprel tarixlərində keçirilib.

## ADPU-da akademik Vaqif Abbasovun elmi seminarı keçirilib






Aprelin 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Kimya və biologiya fakültəsinin təşəbbüsü ilə Azərbaycan Respublikasının Elm və Təhsil Nazirliyinin Akademik Y.Məmmədəliyev adına Neft-Kimya Prosesləri İnstitutunun baş direktoru, akademik Vaqif Abbasovun "Qlobal ekoloji problemlər: səbəbləri, həlli yolları. Yaşıl kimya" mövzusunda elmi seminarı keçirilib.

Əvvəlcə Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov qonaqlarla görüşüb. Görüşdə universitetin faydalı əməkdaşlıqlara hər zaman dəstək olduğunu vurğulanıb.

Tədbirdə Neft-Kimya Prosesləri İnstitutunun əməkdaşları – icraçı direktoru Nizami Mürsəlov, şöbə müdirləri Ayaz Məmmədov və Yengibar Əliyev, Kimya və biologiya fakültəsinin elmi-pedaqoji heyəti və tələbələri iştirak ediblər.

Seminar iştirakçılarını salamlayan fakültənin dekan müavini, dosent Bəsti Əsədova bu kimi tədbirlərin əhəmiyyətini vurğulayıb və görülən işlərdən söz açıb.

Seminarın spikeri, akad. Vaqif Abbasov "Yaşıl dünya naminə həmrəylik ili" çərçivəsində diqqət mərkəzində olan qlobal ekoloji problemlərdən söz açıb, onların həlli yolları haqqında fikirlərini bölüşüb.

Daha sonra mövzu ətrafında müzakirə aparılıb. Müzakirədə müəllim və tələbələr maraqlı fikirlərlə çıxış etmiş, akad. Vaqif Abbasova faydalı seminar üçün təşəkkür etmişlər.

Sonda ADPU-nun Kimya və biologiya fakültəsinin dekanı, dos. Reyhan Ağayeva fakültənin irəli sürdüyü təşəbbüslərə dəstək olduqlarına görə Universsitet rəhbərliyinə və akad. Vafiq Abbasova təşəkkürünü bildirib, gələcək əməkdaşlıqların təhsilin inkişafına yeni töhvələr verəcəyini vurğulayıb.

## ADPU-nun prorektoru, prof. Mahirə Hüseynova Dünya Söz Akademiyasının fəxri akademik üzvü seçilib





Aprelin 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya fakültəsində keçirilən görüşdə Universitetin beynəlxalq əlaqələr üzrə prorektoru, professor Mahirə Hüseynovaya Dünya Söz Akademiyasının fəxri akademik üzvlüyü diplomu təqdim olunub.

Təqdimat mərasimində ADPU-nun rektoru, prof. Cəfər Cəfərov, tədris işləri üzrə prorektor, dos. Eldar Aslanov, Tədris departamentinin direktoru, dos. Sənan Əliyev, Filologiya fakültəsinin dekanı, dos. Könül Həsənova, Dünya Söz Akademiyasının prezidenti, prof. Fəxrəddin İvgin, AMEA-nın Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutunun Mətbuat tarixi və publisistika şöbəsinin müdiri, prof. Vüqar Əhməd, AMEA-nın Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun direktor müavini, dos. Əzizağa Nəcəfov, tədqiqatçı-şair Qardaş Əlişoğlu, eləcə də fakültənin professor-müəllim heyəti və tələbələr iştirak ediblər.

Tədbiri giriş sözü ilə açan prof. Vüqar Əhməd prof. Mahirə Hüseynovanın Dünya Söz Akademiyasının fəxri akademik üzvü seçilməsinin təsadüfi olmadığını, onun görkəmli dilçi alim olmaqla yanaşı, eyni zamanda mahir söz ustası, şair olduğunu vurğulayıb. O, Mahirə Nağıqızının şeirlərində qəlblərə toxunan ifadələri xüsusi ustalıqla qələmə alan sənətkar olduğunu qeyd edib.

Dünya Söz Akademiyasının prezidenti, prof. Fəxrəddin İvgin prof. Mahirə Hüseynovanın Azərbaycanın elm aləmində əhəmiyyətli rolu olduğunu vurğulamaqla yanaşı, eyni zamanda onun Türkiyədə də tanındığını, türk dünyasının görkəmli şəxsiyyəti olduğunu qeyd edib. Natiq, Mahirə Hüseynovanın xalq şairləri və aşıq yaradıcılığı ilə bağlı əhəmiyyətli tədqiqatlarını xüsusilə qeyd edib.

Daha sonra prof. Fəxrəddin İvgin Mahirə Hüseynovaya fəxri akademik üzv diplomunu təqdim edib.

Çıxış edən Əlyazmalar İnstitutunun direktor müavini, dos. Əzizağa Nəcəfov Mahirə Nağıqızı yaradıcılığının tədqiqinin müasir ədəbi mühit üçün əhəmiyyətindən danışıb.

Tədqiqatçı-şair Qardaş Əlişoğlu və ADPU-nun Ədəbiyyatın tədrisi metodikası kafedrasının müdiri, dos. Nazilə Abdullazadə isə prof. Mahirə Hüseynovanın həm ictimai xadim, həm də təşkilatçı və rəhbər kimi uğurlu fəaliyyətini qeyd etmiş, onun bir sıra ölkələrin elmi qurumlarının fəxri doktoru olduğunu diqqətə çatdırmışlar.

ADPU-nun rektoru, prof. Cəfər Cəfərov çıxış edərək prof. Mahirə Hüseynovanın həm kafedra müdiri, həm də fakültə dekanı işlədiyi dövrdən ADPU-nun tarixində müsbət iz qoyduğunu vurğulayaraq, onun beynəlxalq əlaqələr üzrə prorektor olduqdan sonra da Universitet və Azərbaycan elmi üçün etdiyi yeniliklərdən danışıb.

Sonda çıxış edən prof. Mahirə Hüseynova göstərilən diqqətə görə öz təşəkkürünü bildirib, eyni zamanda Azərbaycanda və türk dünyasında tanınmasının universitet rəhbərliyi və fakültə kollektivinin birgə əməyinin nəticəsi olduğunu dilə gətirib.

## "Məktəb liderliyi" proqramı çərçivəsində modullar üzrə yekun qiymətləndirmə başa çatıb




"Məktəb liderliyi" proqramı çərçivəsində tədrisi başa çatan "Məktəbdə səmərəli ünsiyyətin, sağlam psixoloji mühitin təşkili və idarə olunması", "Məktəb sənədləri ilə iş", "Təhsildə qiymətləndirmə və monitorinq", "Məktəb heyətinin idarə olunması" modulları üzrə yekun qiymətləndirmə təşkil olunub. Paytaxt da daxil olmaqla 37 digər şəhər və regiondan olan iştirakçılar ADPU-nun V tədris binasında əyani formada təşkil edilən yekun qiymətləndirmədə iştirak ediblər.

Bununla yanaşı, iştirakçılar üçün film izləmə saatı, keramika bəzəmə master-klası, YARAT Müasir İncəsənət Mərkəzi ilə tanışlıq təşkil olunub, onlar Türkiyənin Başkent Universitetinin professoru Sərvət Özdəmirin ustad dərslərini dinləmək və s. imkanları əldə ediblər.Xatırladaq ki, Elm və Təhsil Nazirliyi və Azərbaycan Dövlət Pedaqoji Universitetinin Strateji İnkişaf Mərkəzi ilə birgə həyata keçirilən "Məktəb liderliyi" proqramı dövlət ümumi təhsil müəssisələrində direktor vəzifəsində çalışan və ya çalışmaq arzusunda olan pedaqoji kadrların idarəetmə ilə bağlı bilik və bacarıqlarının təkmilləşdirilməsinə dəstək göstərən peşəkar inkişaf proqramıdır.

Direktor, direktor müavini və müəllimlərin şəbəkələşməsi, şagird nailiyyətlərinin yaxşılaşdırılması üçün düzgün liderlik strategiyalarının müəyyən edilməsi, problem həlli, əməkdaşlıq, kommunikasiya kimi bacarıqların aşılanması proqramın əsas hədəflərindəndir.

Proqramda 5 modul üzrə 145 saat tədris olunur. Noyabr ayından etibarən modullar üzrə təlimlərə start verilib. Hazırda 2 əyani qrupda 53 nəfər, 3 onlayn qrupda isə 73 nəfər proqramın iştirakçısıdır.

## Şəki filialında "Yaşıl dünya naminə həmrəylik ili"nə həsr olunan tədbirlər keçirilir



"Yaşıl dünya naminə həmrəylik ili" çərçivəsində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki filialında silsilə tədbirlər təşkil olunur. Növbəti belə tədbirdə ekoloji problemlər müzakirə olunub.

Tədbirdə filialın direktoru, dosent Vurğun Məmmədov çıxış edərək çağdaş dünyanın müasir ekoloji problemləri, onların bəşəriyyətə vurduğu zərərlər, bu zərərləri önləmək üçün dünya miqyasında görülən işlər haqqında məlumat verib. Direktor deyib ki, cari ilin noyabr ayında ölkəmizdə keçirilməsi planlaşdırılan COP-29 sammiti Azərbaycanın beynəlxalq nüfuzunun daha da artırılması baxımından müstəsna əhəmiyyətə malikdir. O, bu tədbir çərçivəsində alınacaq qərarların bütün dünyanın qarşıdakı illərdə ekoloji problemlərin həllinə ortaq yanaşmasının əsas norma və prinsiplərini təşkil edəcəyindən əminliyini bildirib.

Daha sonra filialın elmi işlər üzrə direktor müavini, dosent Nuralı Çələbiyev, Tələbə Elmi Cəmiyyətinin sədri, baş müəllim Səadət Feyzullayeva və müxtəlif ixtisasların tələbələri məruzə və təqdimatlarla çıxış etdilər.

Konfransdan sonra filialın həyətində müəllim və tələbələrin iştirakı ilə həmişəyaşıl sərv ağacları əkilib.

Qeyd edək ki, filialın Tələbə Elmi Cəmiyyətinin və Şəki şəhər Rəşid bəy Əfəndiyev adına 10 saylı tam orta məktəbin birgə təşkilatçılığı ilə məktəbdə "Yaşıl dünya naminə həmrəylik ili"nə həsr olunmuş "Ekodost" mövzusunda təlim də təşkil edilib.

## Pedaqoji Universitetin qocaman kitabxanaçıları təltif olunub



Aprelin 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov universitetin Kitbxana-İnformasiya Mərkəzinin qocaman əməkdaşları ilə görüşüb.

Görüşdə, elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov, eləcə də ADPU-nun Kitabxana-İnformasiya Mərkəzinin baş biblioqrafları Süreyya Mustafayeva və Arifə Məhyəddinova iştirak ediblər.

Qocaman kitabxanaçıların təəssüratlarını dinləyən rektor onlara uzunmüddətli səmərəli fəaliyyətlərinə görə təşəkkür edib və 750 min nüsxədən artıq fondu ilə ölkəmizin ikinci ən böyük universitet kitabxanası olan Pedaqoji Universitetin Kitbxan-İnformasiya Mərkəzində əsaslı yenilənmələr aparıldığını, "bp Azərbaycan" şirkətinin dəstəyi ilə elektron kitabxananın yaradıldığını diqqətə çatdırıb.

Sonra Pedaqoji Universitetdə kitabxana işinin təşkili və idarə olunmasında uzunmüddətli səmərəli xidmətlərinə və 70 illik yubileylərinə görə Süreyya Mustafayeva və Arifə Məhyəddinova təşəkkürnamə ilə təltif olunublar.

Qeyd edək ki, Süreyya Mustafayeva 1976-cı ildən ADPU-nun Kitabxana-İnformasiya Mərkəzində çalışır. İşlədiyi müddət ərzində kitabxanaçı, bölmə müdiri və baş biblioqraf vəzifələrində çalışıb. Arifə Məhyəddinova da 1976-cı ildən burada kitabxanaçı, şöbə müdiri və baş biblioqraf vəzifələrində fəaliyyət göstərib. Hər iki əməkdaş işgüzarlıqları ilə kollektivin hörmətini qazanıblar.

## ADPU-da türk professorun məruzəsi dinlənilib



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Pedaqoji Forumunun XIV dinləməsi keçirilib.

Açılış nitqi ilə çıxış edən tədris işləri üzrə prorektor Eldar Aslanov Pedaqoji Forumda bu dəfə Türkiyənin Hacettepe Universitetinin Təhsil fakültəsinin Təhsil elmləri bölməsinin professoru Səlahəddin Gelbalın məruzəsinin dinləniləcəyini diqqətə çatdırıb.

Məruzəçi haqqında məlumat verən prorektor qeyd edib ki, professor Səlahəddin Gelbal həyatının 40 ilindən çoxunu Hacettepe Universitetində təhsil araşdırmalarına, təhsildə qiymətləndirmə üzrə tədqiqatlara sərf edib. Vurğulanıb ki, bu dövrdə professor Səlahəddin Gelbal 50-dək magistant, 40-dək doktorant yetişdirib, tədqiqat sahəsi üzrə beynəlxalq səviyyəli jurnallarda 60-dək elmi məqaləsi dərc olunub. O, müxtəlif illərdə Hacettepe Universitetinin Təhsil İnstitutunun və Təhsil Elmləri bölməsinin rəhbəri vəzifələrində çalışıb.

"Ali təhsildə ölçmə və qiymətləndirmədə yeni çağırışlar" mövzusunda məruzə ilə çıxış edən professor Səlahəddin Gelbal ali təhsil sistemində ölçmə və qiymətləndirmənin önəmi, bu sahədə ən son yanaşmalar, ölçmə və dəyərləndirmə metodları haqqında ətraflı məlumat verib. Qeyd olunub ki, müasir dünyada ölçmə və qiymətləndirmə ali təhsil sisteminin ayrılmaz tərkib hissəsi, təhsilin keyfiyyətinin öncül göstəricilərindəndir. Eyni zamanda, məruzəçi bu sahədə öz təcrübələrini və gəldiyi nəticələri də tədbir iştirakçıları ilə bölüşüb.

Məruzədən sonra iştirakçıların sualları cavablandırılıb, müzakirələr aparılıb.



Dinləmənin sonunda çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov məruzəçiyə minnətdarlığını bildirərək son 7 il ərzində fəaliyyət göstərən Pedaqoji Forumun dinləmələrinin təhsil sahəsində aktual mövzuların və problemlərin müzakirəsi üçün unikal platforma kimi formalaşdığını, eyni zamanda, Forumda təhsil sahəsində ən son dünya trendləri, müasir yanaşmalar haqqında məruzələrin elmi-pedaqoji ictimaiyyətə təqdim olunduğunu diqqətə çatdırıb.

Rektor qeyd edib ki, universitetdə təhsildə ölçmə və qiymətləndirmə sahəsində mütəxəssislərin hazırlanması məqsədilə magistratura səviyyəsində "Təhsildə qiymətləndirmə və monitorinq" ixtisaslaşması üzrə tədris həyata keçirilir, eyni zamanda, davamlı olaraq qabaqcıl təcrübənin öyrənilməsi və tətbiqi istiqamətində iş aparılır.

## "Narkomaniya sərhədsiz fəlakətdir" - ADPU-nun filialında dəyirmi masa



Aprelin 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki filialında tələbə-gənclərin sağlam həyat tərzinin təşviqinə həsr olunmuş "Narkomaniya sərhədsiz fəlakətdir" mövzusunda dəyirmi masa keçirilib.

Tədbiri giriş sözü ilə açan filialın elmi işlər üzrə direktor müavini, dosent Nurali Çələbiyev narkomaniyanın bəşəriyyət üçün ən böyük qlobal bəlalardan biri olması, onun əhatə dairəsinin son onillikdə sürətlə genişlənməsi və insanların sağlamlığına vurduğu zərərlə yanaşı, cəmiyyətdə, o cümlədən ailə həyatında doğurduğu fəsadlardan bəhs edib.

N.Çələbiyev bildirib ki, bu bəşəri bəlaya qarşı respublikamızda ciddi mübarizə tədbirləri Ümummilli Lider Heydər Əliyevin prezidentliyinin ilk dövrlərindən başlanılıb. Ulu Öndər 26 avqust 1996-cı ildə "Narkomanlığa və narkotik vasitələrin qanunsuz dövriyyəsinə qarşı mübarizə" ilə bağlı Fərman imzalayıb, ölkə parlamenti 1999 və 2005-ci illərdə müvafiq qanunlar qəbul edib. Cənab Prezident İlham Əliyevin prezidentliyi dövründə narkomaniya ilə mübarizəyə dair 3 Dövlət Proqramı qəbul edilib. Bununla bağlı sonuncu Dövlət Proqramı "Narkotik vasitələrin, psixotrop maddələrin və onların prekursorlarının qanunsuz dövriyyəsinə qarşı mübarizəyə dair" 2019-2024-cü illəri əhatə edən Dövlət Proqramıdır.

Dəyirmi masada filialın biologiya müəllimi, baş müəllim Səadət Feyzullayeva narkomaniyanın fəsadları ilə bağlı təqdimatla çıxış edib. Filialın Humanitar fənlər kafedrasının müəllimi, hüquqşünas Natiq Salamov və filialın hüquqşünası Elburus Musayev isə narkomanlığın hüquqi aspektləri və doğurduğu hüquqi məsuliyyət haqqında danışaraq qanunvericiliyin tələblərini diqqətə çatdırıblar.

Dəyirmi masada iştirak edən tələbələr müzakirələrdə fəal iştirak edib, bu baladan çıxış yollarının maarifləndirmə tədbirləri ilə bağlı olmasını ən səmərəli vasitə kimi dəstəkləyiblər.

## ADPU ilə Rusiya İnformasiya və Mədəniyyət Mərkəzi əməkdaşlıq məsələlərini müzakirə edib



Rusiya İnformasiya və Mədəniyyət Mərkəzinin rəhbəri İrek Zinnurov, şöbə müdiri Natalya Nenaşeva, baş mütəxəssisi Kristina Kondratyeva və Azərbaycandakı Rusdilli Təhsil Müəssisələri Assosiasiyasının sədri Lyubov Yakunina Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) olublar.

Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev və Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi Taisa Mamedova iştirak ediblər. Məqsəd ADPU ilə Rusiya İnformasiya və Mədəniyyət Mərkəzinin mümkün linqvistik və akademik əməkdaşlığının müzakirəsi və müəllim hazırlığında mərkəzin metodik təcrübəsindən yararlanmaqdır.

Görüşdən sonra qonaqlar ADPU-nun tədris binası, eləcə də kitabxana və Heydər Əliyev muzeyi ilə tanış olublar.

## ADPU-da maarifləndirici tədbir: MİQ sessiyası



Aprelin 19-da "Code for future" layihəsi çərçivəsində Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Elm və Təhsil Nazirliyi, Pedaqoji Universitet və Alqoritmika şirkətinin birgə təşkilatçılığı ilə "MİQ sessiyası" mövzusunda tədbir keçirilib.

İnfosessiyada, əsasən, Pedaqoji Universitetin riyaziyyat və informatika müəllimliyi və informatika müəllimliyi ixtisaslarında təhsil alan, eləcə də "Code for future" layihəsinin iştirakçısı olan tələbələr iştirak ediblər.

Əvvəlcə, Alqoritmika şirkətinin "Code for future" layihəsinin ali təhsil müəssisələri arasında ilk dəfə ADPU-da həyata keçirilməsində əvəzsiz xidmətləri olmuş Universitetin Riyaziyyat fakültəsinin mərhum dekanı, dosent Araz Fərəcovun xatirəsi yad edilib.

Tədbirdə çıxış edən ADPU-nun strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva müəllim peşəsinin artan nüfuzundan, regionlarda müəllim kadrlarına olan ehtiyac, gənc müəllimlərimizin regionlarda işləyərək yerlərdə icmalara dəstək olmasının önəmindən söz açıb. Məzun olan gənc müəllimlərin mənimsədikləri müasir innovativ təlim yanaşmalarını tətbiq

edərək yarada biləcəkləri motivasiya, öyrənmə mühitinin bir şagirdə necə müsbət təsir edə biləcəyi haqqında fikirlərini bölüşüb.

Məktəbəqədər və Ümumi Təhsil üzrə Dövlət Agentliyinin (MÜTDA) Layihələrin təşkili və idarə edilməsi şöbəsinin aparıcı mütəxəssisi Fəridə Həsənli müəllimlərin işə qəbulu (MİQ) müsabiqəsinə müraciət qaydaları, elektron sistemlə iş qaydaları, müəllimlərin qeydiyyatdan keçərkən yaşadığı regionu qeyd etmələrinin önəmi, eləcə də illər üzrə MİQ-ə müraciət və yerdəyişmə statistikaları, ən çox müəllimə ehtiyac duyulan fənlər haqqında geniş təqdimat edib.

MÜTDA-nın şöbə müdiri Fidan Nəcəfova isə Pedaqoji Universitetin məzunlarının MİQ müsahibəsində göstərdiyi nəticələrdən danışaraq, əsasən ibtidai sinif müəllimliyi və informatika müəllimliyi ixtisaslarının məzunlarının daha yüksək nəticə göstərdiyini diqqətə çatdırıb.

Alqoritmika şirkətinin nümayəndəsi Qəmər Məmmədova və şirkətin "Code for future" layihəsinin rəhbəri Nəzrin Əliyeva da öz növbələrində müəllimlik peşəsinin üstünlüklərindən və bu sahədəki perspektiv imkanlardan söz açıb, "Rəqəmsal bacarıqlar" layihəsinin əhatə dairəsi və layihə çərçivəsində gələcək planlar haqqında danışıblar. Qeyd olunub ki, gələcəkdə layihənin bütün regionları əhatə etməsi planlaşdırılır.

Çıxışlarda, həmçinin Elm və Təhsil Nazirliyi tərəfindən həyata keçirilən islahatlar, müəllimlərin əmək haqqılarının artırılması, müəllimlərin sertifikasiyası əsasında difersensial əmək haqqı sisteminin və rəğbətləndirmələrin tətbiqi, region məktəblərinin və maddi-texniki təchizatlarının yaxşılaşdırılması məsələlərinə toxunulub.

Çıxışlardan sonra tələbələrin sualları cavablandırılıb, onları maraqlandıran məsələlərə aydınlıq gətirilib.

## ADPU-da "Heydər Əliyev dərsləri" davam edir



Aprelin 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Heydər Əliyev dərsləri"nin növbəti məşğələsi keçirilib.

Universitetin Heydər Əliyev Mərkəzində baş tutan məşğələdə Tarix və coğrafiya fakültəsinin coğrafiya müəllimliyi ixtisasının COG2303 və COG2304 qruplarının tələbələri iştirak ediblər.

Dərsin əvvəlində onlar Ümummilli Lider Heydər Əliyevin Azərbaycan tarixindəki yeri və rolu haqqında məruzəni dinləyiblər. Məruzədə qeyd edilib ki, Heydər Əliyev fitri istedadı və gərgin əməyi sayəsində istər təhsil illərində, istərsə də dövlət və partiya orqanlarında çalışdığı zaman ən yüksək nailiyyətlər qazana bilib. Ulu Öndər 1969-1982-ci illərdə Azərbaycana uğurla rəhbərlik edib, onun hərtərəfli inkişafını təmin edərək Sovet İttifaqının 15 respublikası arasında qabaqcıl mövqelərə çıxarıb. Müstəsna keyfiyyətlərinə görə Heydər Əliyev 1982-ci ildə SSRİ-nin ali partiya və dövlət rəhbərlərindən biri səviyyəsinə yüksəlib. 1993-cü ildə xalqın tələbi ilə ikinci dəfə siyasi hakimiyyətə qayıdan Ümummilli Lider qısa müddətdə ölkədə tüğyan edən xaos və anarxiyanın, etnik separatizm təzahürlərinin qarşısını alıb, hakimiyyəti silahlı yolla devirmək praktikasına birdəfəlik son qoyub. Beləliklə, Azərbaycan yenicə qazandığı müstəqilliyini itirmək təhlükəsindən qurtulub, həyata keçirilən kompleks islahatlar sayəsində davamlı sosial-iqtisadi inkişaf yoluna qədəm qoyub. Təsadüfi deyil ki, 1969-2003-cü illər arasındakı zaman kəsiyi haqlı olaraq "Azərbaycan tarixinin Heydər Əliyev mərhələsi" adlandırılır.




Məruzədən sonra mütəxəssis Tərlan Ağayev dərsin iştirakçılarını mərkəzdə nümayiş olunan fotolar, arxiv sənədlərinin surətləri və digər eksponatlarla tanış edib, onlara Heydər Əliyevin həyat və fəaliyyətinin müxtəlif dövrləri barədə məlumat verib. Tələbələr Ulu Öndərə həsr edilmiş sənədli filmə maraqla tamaşa ediblər.

İştirakçıların fəallığı ilə keçən dərs sual-cavab və qarşılıqlı müzakirələrlə başa çatıb.

## "Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri" müsabiqəsinin yarımfinalçıları üçün təlimlərə start verilib









Aprelin 20-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri" müsabiqəsinin yarımfinalçıları üçün püşkatma və yarımfinal haqqında məlumat sessiyası keçirilib.

Eyni zamanda iştirakçılara dəstək məqsədi ilə idarəetmə sahəsində aktual mövzularda təlimlərə start verilib. İlk olaraq təlimçi Rüfət Əsədzadənin təqdimatında "Layihə yazılması və idarə olunması", müsabiqənin layihə rəhbəri, ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin müdiri Cavid Hüseynovun təqdimatında isə "Təşkilati idarəetmə və korporativ stil" mövzusunda təlimlər təşkil olunub. İnteraktiv şəraitdə keçən təlimlərdə yarımfinalçılara müvafiq sahələr üzrə zəruri məlumatlar verilib, suallar cavablandırılıb.

Növbəti həftəsonu da təlimlərin davam edəcəyi gözlənilir. Qeyd edək ki, "Sən də bacararsan!" şüarı ilə keçirilən müsabiqənin məqsədi ADPU-nun bakalavriat və magistrantlarının potensiallarını aşkara çıxarmaq, onların peşəkar və karyera inkişafına dəstək olmaq, eləcə də universitetin kadr bankını möhkəmləndirməkdir.

"bp Azərbaycan" şirkəti, "Prestij-S" Tədris Mərkəzi və "IT Brains Academy"in sponsorluğu ilə keçirilən müsabiqənin 10 qalibinin hər birini 1000 AZN pul mükafatı, 1 illik mentorluq proqramı, İT və xarici dil üzrə kurslardan yararlanmaq, eləcə də kadr bankına daxil olmaq imkanı gözləyir.

## ADPU-dan dünyanın ən böyük robot festivalı "Robotex Türkiyə"də möhtəşəm uğur: 3 komanda qalib oldu

Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) 20-21 aprel tarixlərində dünyanın ən böyük robot festivalı olan "Robotex"in Türkiyənin Antalya şəhərində keçirilən yarımfinal mərhələsində möhtəşəm uğura imza atıb. ADPU-nun yarışmada iştirak edən 3 komandasının hər biri qalib olub. Belə ki, ADPU-nun Kompüter elmləri kafedrasının və STEAM Mərkəzinin müəllimi Xumarə Qəhrəmanlının mentorluğu ilə yarışa qatılan "ADPU GİRLS" komandası "Girls Firefighting" kateqoriyası üzrə I yerə, "HYDROTESK" komandası "Water Rally" kateqoriyası üzrə I yerə, "AZİRRİGATİON" komandası isə "Green Entrepreneurship" kateqoriyası üzrə III yerə layiq görülüb. Qeyd edək ki, Estoniyada əsası qoyulan "Robotex" festivalı dünyanın ən böyük robot yarışması hesab edilir. 2024-cü ildə keçirilən "Robotex Türkiyə" yarışmasında dünyanın 11 ölkəsindən 18 fərqli kateqoriya üzrə 400-dən çox komanda, 2500-dən artıq iştirakçı yarışıb. Qalib komandalar "Robotex"in final mərhələsində iştirak hüququ qazanıblar. Eyni zamanda, ADPU-nun STEAM Mərkəzinin direktoru, dosent Arzu Daşdəmirov da "Robotex Türkiyə"də ziyarətçi qismində iştirak edib.







Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ

## ADPU-da Pedaqoji-psixoloji xidmət laboratoriyasının açılışı olub







Aprelin 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil fakültəsinin nəzdində fəaliyyət göstərən Pedaqoji-psixoloji xidmət laboratoriyasının açılışı olub.

Laboratoriyanın açılış mərasimində ADPU-nun rektoru, professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, rektorun müşaviri Ümid Mehdiyev, Məktəbəqədər təhsil fakültəsinin dekanı, dosent Nailə Hüseynova, eləcə də müvafiq struktur rəhbərləri, kafedra müdirləri, müəllim və tələbələr iştirak ediblər. Qeyd edək ki, ADPU-nun Pedaqoji-psixoloji xidmət laboratoriyasının yaradılmasının əsas məqsədi fakültənin ixtisas profilinə uyğun olaraq təhsil alan tələbələrin əldə etdiyi akademik bilikləri mütəxəssislərin dəstəyi ilə praktik mənimsəmələrini, müvafiq bacarıqlar əldə etmələrini təmin etmək, ixtisas üzrə vərdişlər formalaşdırmaq, onların tipik və atipik uşaqlarla məşğələlərini təşkil etməkdir.

Laboratoriyada 5 istiqamətdə fəaliyyətin təşkil olunması nəzərdə tutulur: loqopediya, psixologiya, defektologiya (korreksiya pedaqogikası), idman və peşə reablitasiyası. İdman sahəsi üzrə uşaqlarda dayaq-hərəkət aparatının müxtəlif problemlərinin korreksiyası üçün laboratoriyada idman otağı fəaliyyət göstərir.



Burada uşaqların fiziki sağlamlığını möhkəmləndirmək məqsədi ilə məşğələlər aparılacaq.

Psixologiya sahəsi üzrə tipik və atipik uşaqların öz düşüncələrini və emosiyalarını ifadə etmələri üçün təhlükəsiz və rahat mühiti təmin etmək, psixoloji ehtiyaclarını qiymətləndirmək, lazım gəldikdə terapiya və ya məsləhətlər vermək, uşaqlara və onların ailələrinə dəstək olmaq əsas fəaliyyət istiqamətləridir. Mütəxəssislərin iştirakı ilə tələbələrin praktik bacarıqlarını inkişaf etdirmələri və onların psixoloq kimi formalaşmasına dəstək olmaq əsas hədəflərdən biridir.

Defektologiya otağı inkişaf və ya öyrənmə çətinliyi olan uşaqların ehtiyaclarını ödəmək üçün nəzərdə tutulub.

Loqopediya otağında loqopedlər tərəfindən fərdi və ya kiçik qruplar şəklində müxtəlif məşqlər, fəaliyyətlər və müdaxilələr vasitəsilə uşaqların ünsiyyət bacarıqlarının inkişafına dəstək göstəriləcək.

Oyun terapiyası bölməsi isə uşaqların oyunlar vasitəsilə fiziki, koqnitiv, emosional və sosial inkişafını dəstəkləmək üçün nəzərdə tutulub.

Laboratoriya uşaqlara keyfiyyətli erkən uşaqlıq təhsili və inkişaf proqramlarına çıxış imkanları təmin edir, onların gələcək öyrənmə və uğurları üçün güclü zəmin yaradır.

Ümumiyyətlə, ADPU-nun Pedaqoji-psixoloji xidmət laboratoriyası təkcə akademik bacarıqlara deyil, həm də sosial, emosional, fiziki və yaradıcı inkişafa diqqət yetirilərək inkişafa vahid yanaşma təklif edir.

## Başsağlığı

**Təəssüf ki, 2024-cü ilin ilk rübündə əldə olunan uğurlar, yeniliklərlə yanaşı, Pedaqoji Universitet ailəsinə böyük itkilər də üz verib.**

**Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisasının IV tədris ili, AZD2005B saylı qrup tələbəsi İbayevanın qızılca xəstəliyindən dünyasını dəyişməsi, Riyazi analiz kafedrasının müdiri, professor Bəhram Əliyev və Riyaziyyat fakültəsinin dekanı, dosent Araz Fərəcovun qəfil və vaxtsız dünyadan köçmələri bizləri dərindən sarsıdıb.**

**Pedaqoji Universitetin rəhbərliyi, çoxminli professor-müəllim və tələbə kollektivi adından mərhum tələbəmiz və həmkarlarımızın ailələrinə böyük hüznlə başsağlığı veririk. Onların unudulmaz xatirələri daim qəlbimizdə yaşayacaq.**

**Allah rəhmət eləsin!**



Sevil İbayeva
Tələbə



Professor Bəhram Əliyev
Kafedra müdiri



Dosent Araz Fərəcov
Dekan


### Redaksiya heyəti



Professor Cəfər Cəfərov
Müşahidə şurasının sədri



Dosent Eldar Aslanov
Müşahidə şurasının üzvü



Professor Asəf Zamanov
Müşahidə Şurasının üzvü



Professor Fikrət Rzayev
Müşahidə Şurasının üzvü



Professor Mahirə Hüseynova
Müşahidə Şurasının üzvü



Könül Pirverdiyeva
Müşahidə Şurasının üzvü



Tural Cəlilov
Müşahidə Şurasının üzvü



Cavid Hüseynov
Redaktor



Taleh Mirzəyev
Redaktor



Nurlan Səmədov
Fotoqraf



Elvin Vahidov
Dizayner

*Fotolar Nurlan Səmədovundur. Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı" MMC-də çap olunub. Sifariş №: 996*

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.